Hakikat Kitabevi nəşrləri No: 3

**Hər Kəsə Lazım Olan İman**
**Mövlanə Xalidi Bağdadi**

Tərcümə edən:
**Kəmahlı Feyzullah Əfəndi**

Hazırlayan:
**Hüseyn Hilmi İşıq**

Bakı, “N/R” Nəşriyyat-Poliqrafiya Mərkəzi, 2021, 88 səh.

Hakikat Kitabevi
Daruşşəfəqa küç: No; 53. P.K. 35. 34084.
Tel: 0090-212 523 45 56-523 58 43. Fax: 0090-523 36 93
http://www.hakikatkitabevi.com.tr
e-mail:bilgi@hakikatkitabevi.com.tr
Fatih, İstanbul

**Çap**: İhlas Gazetecilik A. Ş. 29 Ekim Küç: No: 23
Yenibosna, İstanbul Tel: 0090-212 454 30 00
ISBN: 975 92119-0-4

**“Sübhanallahi və bihəmdihi sübhanallahil-azım”**.
Bu kəlmeyi-tənzihi səhər və axşam yüz dəfə oxuyanın günahları bağışlanar, bir daha günah iş görməkdən qorunar. Bu dua, **“Məktubat tərcüməsi”** kitabının 307 və 308-ci məktublarında yazılmışdır.
Bütün dərdlərin yox olmasına da səbəb olar.

## ÖN SÖZ

**Bəsmələylə başlayaq kitaba,**
**Allah adı ən yaxşı bir pənahdır.**
**Nemətləri sığmaz ölçü-hesaba,**
**Çox rəhmkar, əfvi sevən bir Rəbdir!**

*Allahu təala dünyada bütün insanlara rəhm edir. Möhtac olduqları şeyləri yaradıb, hər kəsə göndərir. Əbədi səadətə qovuşduran yolu göstərir. Nəfslərinə, pis yoldaşlara, zərərli kitablara və xarici radiolara aldanaraq, bu səadət yolundan ayrılanlardan, küfr və zəlalət yoluna düşənlərdən peşman olub, bağışlanmaq istəyənləri hidayətə qovuşdurur. Bunları əbədi fəlakətdən xilas edir. Azğın və zalım olanlara bu nemətini ehsan etmir. Onları bəyəndikləri, istədikləri küfr yolunda qoyur. Axirətdə Cəhənnəmə getməsi lazım gələn möminlərdən dilədiyini ehsan edərək bağışlayacaq, Cənnətə qovuşduracaqdır. Hər canlını yaradan, hər varlığı hər an varlıqda saxlayan, hamısını qorxu və dəhşətdən qoruyan yalnız Odur. Belə bir Allahın şərəfli adına pənah apararaq, yəni Ondan yardım gözləyərək bu kitabı yazmağa başlayırıq.*

*Allahu təalaya həmd olsun. Onun sevgili Peyğəmbəri Muhamməd əleyhissəlama salam və dua olsun. O uca Peyğəmbərin təmiz Əhli beytinə və adil, sadiq Əshabının hər birinə xeyirli dualar olsun.*

*Həmd, bütün nemətləri Allahu təalanın yaradıb göndərdiyinə inanmaq və bunu dillə ifadə etməkdir. Şükür, bütün nemətləri islamiyyətə uyğun istifadə etməkdir.*

*İslam dininin inanclarını, əmrlərini və qadağalarını bildirən minlərlə qiymətli kitab yazılmış, bunların çoxu xarici dillərə tərcümə edilərək bir çox ölkəyə yayılmışdır. Buna baxmayaraq, yanlış fikirli, dar düşüncəli kəslər və ingilis casuslarına aldanmış cahil din adamları və zındıqlar hər zaman islamın faydalı, feyzli və işıqlı əhkamına, yəni əmrlərinə, qadağalarına hücum etmiş, onu ləkələməyə, dəyişdirməyə və müsəlmanları aldatmağa cəhd etmişlər.*

*İslam alimlərinin hal-hazırda da dünyanın demək olar ki, hər yerində islam etiqadını yaymağa, müdafiə etməyə çalışdıqları çox şükür olsun ki, görülməkdədir. İslamiyyəti Əshabı-kiramdan eşidərək, kitablara yazan doğru yolun alimlərinə "Əhli-sünnət alimləri" deyilir. Əhli-sünnət alimlərinin kitablarını oxumamış və ya anlaya bilməmiş bir neçə nəfərin Qurani-kərimdən və hədisi-şəriflərdən səhv mənalar çıxararaq, yanlış çıxışları və yazıları görülsə də, belə sözlər və yazılar müsəlmanların sağlam imanı qarşısında əriyib getməkdə, sahibinin savadsızlığını göstərməkdən başqa təsiri olmamaqdadır.*

*Müsəlman olduğunu deyən və ya camaat ilə namaz qılarkən görülən bir kəsin müsəlman olduğu aydın olur. Sonra, onun bir sözündə, yazısında və ya bir hərəkətində Əhli-sünnət alimlərinin bildirdikləri iman bilgilərinə uyğun gəlməyən bir şey görülsə, bunun küfr və ya zəlalət olduğu ona izah edilməlidir. Bundan imtina edib, tövbə etməli olduğu deyilməlidir. Qıt ağlı, yanlış düşüncəsi ilə cavab verib səhvini anlamasa, bu adamın yolunu azmış və ya mürtəd olduğu, yaxud ingilis kafirlərinə satılmış olduğu aydın olur. Bu adam namaz qılsa, həccə getsə, hər ibadəti və yaxşılığı etsə də, bu fəlakətdən xilas ola bilməz. Küfrə səbəb olan şeydən dönmədikcə və buna tövbə etmədikcə müsəlman ola bilməz. Hər müsəlman küfrə səbəb olan şeyləri yaxşı öyrənərək, mürtəd olmaqdan qorunmalı, kafir olanları və müsəlman görünən zındıqları və ingilis casuslarını yaxşı tanıyıb, zərərlərindən qorunmalıdır.*

*Qurani-kərimdən və hədisi-şəriflərdən yanlış, zay mənalar çıxarılacağını, beləcə yetmiş iki cür yolunu azmış müsəlman firqənin törəyəcəyini Rəsulullah (sallallahu aleyhi və səlləm) xəbər vermişdir. "**Bəriqa**" və "**Hadiqa**" kitabları bu hədisi-şərifi "Buxari" və "Müslim" kitablarından nəql edərək, izah etməkdədir. Böyük islam alimi və din professoru adı altında ortaya çıxan bu yanlış firqələrdəki şəxslərin kitablarına və konfranslarına aldanılmamaq, bu din, iman oğrularının qurduqları pusquya düşməmək üçün ayıq olmaq lazımdır. Bu cahil müsəlmanlardan başqa, dinimizə düşmən olan şəxslər və onlardan maaş alanlar da bir yandan, cürbəcür*

*taktikalarla müsəlman övladlarını aldatmağa çalışırlar. Qondarma yazılar, kinolar, tamaşalar və radio, televiziya proqramları ilə islamı və imanı yox etməyə can atırlar. Bu yolda milyardlarla pul xərcləyirlər. İslam alimləri (rəhimə-humullahu təala) onların hamısına lazım olan cavabları əvvəlcədən yazmış və Allahu təalanın dinini, hüzur və qurtuluş yolunu bildirmişlər.*

*Həqiqi alimlərdən böyük islam alimi mövlana Xalidi Bağdadi Osmaninin (qüddisə sirruh) "**Etiqadnamə**" kitabını seçdik. Bu kitab Kəmahlı mərhum Hacı Feyzullah Əfəndi tərəfindən türk dilinə tərcümə edilərək "**Fəraidul-fəvaid**" adı verilmiş və hicri 1312-ci ildə Misirdə nəşr edilmişdir. Bu tərcüməni sadələşdirərək, "**Hər kəsə lazım olan iman**" adını verdik. İlk dəfə 1966-cı ildə nəşr olundu. Bizim yazdığımız izahları kitabdan ayırmaq üçün künc mötərizədən [ ] istifadə etdik. Nəşr olunmasını nəsib etdiyi üçün Allahu təalaya sonsuz həmd və şükürlər olsun! Bu tərcümənin farsca olan əsli, İstanbul Universiteti kitabxanasının "İbnul-Əmin Mahmud Kamal Bəy" hissəsində "**Etiqadnamə**" adı ilə F. 2639 nömrədə mövcuddur. Türkcə tərcüməsini **"Həqiqət Kitab evi"** "**İman və İslam**" adı ilə nəşr etmişdir.*

*"**Dürrül-muxtar**" kitabının sahibi fəzilətli Əlauddini Həskəfi (rahiməhullahu təala), kafirin nikahı bəhsinin sonunda deyir ki, "Nikahlı müsəlman bir qız həddi büluğa çatdığı zaman müsəlmanlığı bilməsə, nikahı pozular [Yəni mürtəd olar].. Allahu təalanın sifətlərinin ona bildirilməsi lazımdır. O da, təkrar etməli və bunlara inandım deməlidir". İbni Abidin bunu izah edərkən deyir ki, "Qız kiçik ikən, anasına və atasına tabe olaraq müsəlmandır. Həddi büluğa çatdıqda ana və atasının dininə tabe olması davam etməz. İslamiyyəti bilmədən büluğ olduqda mürtəd olur. İman ediləcək altı şeyi öyrənib, inanmadıqca və islamiyyətə riayət etməyin lazım olduğuna inanmadıqca, **"Kəlimeyi-tövhid"** desə, yəni **"La ilahə illallah, Muhəmmədun rəsulullah"** desə də, müsəlmanlığı davam etməz. **"Aməntu billahi..."**də yer alan altı şeyi öyrənib, bunlara inanması və Allahu təalanın əmrlərini və qadağalarını qəbul etdim deməsi lazımdır". İbni Abidinin bu sözündən aydın olur*

*ki, bir kafir Kəlimeyi-tövhid dedikdə və bunun mənasına qısa şəkildə inandığı anda müsəlman olar. Ancaq, hər müsəlman kimi o da, imkan tapdıqca,* ***"Aməntu billahi və Məlaikətihi və kutubihi və rusulihi vəl yəvmil-axıri və bil qadəri xayrihi və şərrihi minallahi təala vəl-bəasu bəadəlməvti haqqun, əşhədü ən lailahə illallah və əşhədü ənnə Muhəmmədən abduhu və rasuluhu"*** *deyə Aməntunun əsaslarını əzbərləyib, mənasını və islam bilgilərindən özünə lazım olanları yaxşı öyrənməlidir. Bir müsəlman övladı da bu altı şeyi və islam bilgilərini öyrənməzsə və inandığını deməzsə, aqil və büluğ olduğu zaman mürtəd olar. İman etdikdən sonra,* ***"İslam bilgiləri"****ni, yəni fərzləri, haramları, dəstamazı, qüslü, namazın qılınma qaydasını və övrət yerini örtməyi vaxt itirmədən soruşub öyrənməsi də fərzdir. Soruşduğu şəxsin öyrətməsi və ya həqiqi din kitabı bildirməsi də fərzdir. Soruşacaq kimsəsi yoxdursa və ya kitabı tapa bilməzsə axtarması fərzdir, axtarmasa kafir olar. Tapana qədər bilməməsi üzr sayılır. Fərzləri vaxtında yerinə yetirməyən və haram iş görən Cəhənnəmdə əzab görəcəkdir. İmanın altı əsası haqqında bu kitabımızda geniş məlumat vardır. Hər müsəlman bu kitabı yaxşı oxumalı, uşaqlarının və bütün tanışlarının oxumaları üçün cəhd göstərməlidir.*

*Kitabımızda ayəti-kərimələrin mənalarını yazarkən, "Məalən buyuruldu" şəklində yazılmaqdadır. "Məalən", "təfsir alimlərinin bildirdiklərinə görə" deməkdir. Çünki, ayəti-kərimələrin mənalarını yalnız Rəsulullah (sallallahu aleyhi və səlləm) anlamış və Əshabına bildirmişdir. Təfsir alimləri bu hədisi-şərifləri münafiqlərin və ingilis kafirlərinə satılmış olan zındıqların, yəni məzhəbsiz din adamlarının uydurduqları hədislərdən ayırmış, tapa bilmədikləri hədisi-şəriflər üçün təfsir elminə müraciət edərək, ayəti-kərimələrə özləri məna vermişlər. Ərəbcə bilən, ancaq təfsir elmindən xəbəri olmayan din cahillərinin anladıqlarına* ***"Quran təfsiri"*** *deyilməz. Buna görə də, hədisi-şərifdə,* ***"Qurani-kərimə öz başa düşdüyünə görə məna verən kafir olar"*** *buyurulmuşdur.*

*Allahu təala hamımızı Əhli-sünnət alimlərinin bildirdiyi doğru yolda tutsun! İslam cahillərinin və böyük islam alimi kimi adlar*

*daşıyan məzhəbsizlərin, münafiqlərin qulağa xoş gələn, hiyləli yalanlarına aldanmaqdan qorusun! Amin.*

*Hakikat Kitabevinin nəşr etdiyi bütün kitablar hər dildə internet vasitəsi ilə bütün dünyaya yayılmaqdadır.*

| Miladi il | Hicri Şəmsi | Hicri Qəməri |
|---|---|---|
| **2001** | **1380** | **1422** |

**İzah:** Missionerlər xristianlığı yaymağa, yəhudilər Talmutu yaymağa, İstanbuldakı Hakikat Kitabevi islamiyyəti yaymağa, masonlar isə dinləri yox etməyə çalışırlar. Ağlı, elmi və insafı olan bunlardan doğrusunu dərk edər, anlayar. Bunun yayılmasına yardım edərək, bütün insanların dünyada və axirətdə səadətə qovuşmalarına səbəb olar.

Bu gün dünyadakı müsəlmanlar arasında Əshabı-kiramın yolunda olan həqiqi müsəlmanlar ilə birlikdə fərqli firqələrə ayrılmış səhv olanları da mövcuddur.

Hər mömin nəfsini təzkiyə üçün, yəni yaradılışında olan cahillikdən və günahlardan təmizlənmək üçün hər zaman **“La ilahə illallah”** oxumalı və qəlbini təsfiyə üçün, yəni nəfsindən, şeytandan, pis yoldaşlardan və zərərli, yanlış kitablardan gəlmiş olan küfr və günahlardan xilas olmaq üçün, **“Əstağfirullah”** oxumalıdır. İslamiyyətə riayət edənin və günahlarına tövbə edənin duaları qəbul olar. Namaz qılmayanın, açıq-saçıq qadınlara və övrət yeri açıq olanlara baxanın, haram yeyib-içənin, islamiyyətə riayət etmədiyi aydın olur. Bunların duaları qəbul olmaz.

## BAŞLANĞIC

Mövlana Xalidi Bağdadi (qaddəsallahu təala sirrəhul-aziz), kitabına başlamazdan əvvəl **İmam Rabbani Əhməd Faruqi Sərhəndinin** (rahmətullahi aleyh) **"Məktubat"** kitabının üçüncü cildinin on yeddinci məktubunu yazaraq, kitabına zinət və bərəkət vermək istəmişdir.

İmam Rabbani (quddisə sirruh)[1] bu məktubunda buyurur ki: Məktubuma Bəsmələ ilə başlayıram. Bizlərə hər neməti göndərən, ən böyük nemət olaraq, müsəlman etməklə şərəfləndirən və Muhamməd əleyhissəlama ümmət etməklə qiymətləndirən Allahu təalaya həmd və şükürlər olsun!

Çox yaxşı düşünmək və anlamaq lazımdır ki, hər kəsə hər neməti göndərən yalnız Allahu təaladır. Hər şeyi var edən ancaq Odur. Hər varlığı hər an varlıqda saxlayan daim Odur. Qullardakı üstün və yaxşı sifətlər Onun lütfü və ehsanıdır. Həyatımız, ağlımız, elmimiz, gücümüz, görməyimiz, eşitməyimiz, danışa bilməyimiz də hamısı Ondandır. Saymaqla bitməyən müxtəlif nemətləri və yaxşılıqları göndərən yalnız Odur. İnsanları çətinliklərdən, sıxıntılardan xilas edən, duaları qəbul edən, dərdləri və bəlaları yox edən hər zaman Odur. Ruziləri yaradan və yetirən yalnız Odur. Ehsanı o qədər boldur ki, günah işləyənlərin ruzisini kəsmir. Günahları örtməsi o qədər çoxdur ki, əmrinə tabe olmayan, qadağalarından çəkinməyən azğınları hər kəsə rəzil və rüsvay etmir, namus pərdələrini yırtmır. Əfvi və mərhəməti o qədər çoxdur ki, cəzaya və əzaba layiq olanlara əzab verməkdə tələsmir. Nemətlərini, ehsanlarını dostlarına və düşmənlərinə verir. Heç kimdən bir şey əsirgəmir. Bütün nemətlərinin ən üstünü, ən qiymətlisi olaraq da doğru yolu, səadət və xilas yolunu göstərir. Yoldan azmamaq və Cənnətə girmək üçün təşviq edir. Cənnətdəki əbədi nemətlərə, bitməz, tükənməz zövqlərə və öz rizasına, sevgisinə qovuşa bilməyi-

[1] İmam Rabbani 1034-cü ildə (m. 1624) vəfat etmişdir.

miz üçün sevgili Peyğəmbərinə (sallallahu təala aleyhi və səlləm) tabe olmağımızı əmr edir. Budur, Allahu təalanın nemətləri günəş kimi meydandadır. Başqalarından gələn yaxşılıqlar yenə Ondan gəlməkdədir. Başqalarını vasitə edən, onlara yaxşılıq etmək istəyini verən, onlara yaxşılıq edə biləcək gücü və qüvvəti verən, yenə Odur. Bunun üçün hər yerdən, hər kəsdən gələn nemətləri göndərən hər zaman Odur. Ondan başqasından yaxşılıq və ehsan gözləmək, əmanətçidən əmanət olaraq bir şey istəməyə və yoxsuldan sədəqə istəməyə bənzəyər. Bu sözlərimizin yerində və doğru olduğunu cahil olanlar da alimlər kimi, savadsızlar da zəkalı, iti görüşlü olanlar kimi bilir. Çünki izah olunanlar açıq-aşkar, düşünməyə belə lüzum olmayan məlumatlardır.

İnsanın bu nemətləri göndərən Allahu təalaya gücü çatdığı qədər şükür etməsi insanlıq vəzifəsidir. Ağlın əmr etdiyi bir vəzifə, bir borcdur. Ancaq Allahu təalaya edilməli olan bu şükrü yerinə yetirə bilmək asan bir iş deyildir. Çünki insanlar yox ikən sonradan yaradılmış, zəif, möhtac, eyibli və qüsurludurlar. Allahu təala isə daima var və əbədi olaraq vardır. Eyiblərdən və qüsurlardan uzaqdır. Bütün üstünlüklərin sahibidir. İnsanların Allahu təalaya heç bir cəhətdən bənzərlikləri, oxşarlıqları yoxdur. Belə alçaq qullar elə bir uca Allahın şanına yaraşan bir şükür edə bilərlər məgər? Çünki çox şey vardır ki, insanlar onları gözəl və qiymətli zənn edir. Ancaq Allahu təala bunları pislik hesab edir və bəyənməz. Hörmət və şükür hesab etdiyimiz şeylər, bəyənilməyən və xoş olmayan şeylər ola bilər. Buna görədir ki, insanlar öz qüsurlu ağılları, dar düşüncələri ilə Allahu təalaya qarşı şükür, hörmət ola biləcək şeyləri tapa bilməzlər. Şükür və hörmət etməyə yarayan vəzifələr Allahu təala tərəfindən bildirilmədikcə, tərifləmək zənn edilən şeylər pisləmək ola bilər.

Beləliklə, insanların Allahu təalaya qarşı qəlblə, dillə, bədənlə etmələri və inanmaları lazım olan şükür borcu, qulluq vəzifələri Allahu təala tərəfindən bildirilmiş və Onun sevgili Peyğəmbəri (sallallahu təala aleyhi və səlləm) tərəfindən ortaya qoyulmuşdur. Allahu təalanın göstərdiyi və əmr etdiyi qulluq vəzifələrinə **İslamiyyət** deyilir. Allahu təalaya şükür Onun Peyğəmbərinin göstər-

diyi yola tabe olmaqla olar. Allahu təala bu yola tabe olmayan, bunun xaricində qalan heç bir şükrü, heç bir ibadəti Allahu təala qəbul etməz və bəyənməz. Çünki insanların yaxşı, gözəl zənn etdikləri çox şey vardır ki, islamiyyət bunları bəyənməməkdə və çirkin olduqlarını bildirməkdədir.

Deməli, ağlı olan kimsələrin Allahu təalaya şükür etməsi üçün Muhamməd əleyhissəlama tabe olmaları lazımdır. Onun yoluna **“İslamiyyət”** deyilir. Muhamməd əleyhissəlama tabe olan hər kəsə **“Müsəlman”** deyilir. Allahu təalaya şükür etməyə, yəni Muhamməd əleyhissəlama tabe olmağa **“İbadət etmək”** deyilir. İslam bilgiləri iki cürdür: Din bilgiləri və fənn bilgiləri. Dində reformistlər dini bilgilərə **“Skolastik bilgilər”**, fənn bilgilərinə **“Rasional bilgilər”** deyirlər. Din bilgiləri də iki yerə ayrılır:

1 - Qəlb ilə etiqad edilməsi, yəni inanılması lazım olan bilgilərdir. Bu elmlərə **“Üsuli din”** və ya **“İman”** bilgiləri deyilir. Qısacası, **“İman” -** Muhamməd əleyhissəlamın bildirdiyi altı şeyə inanmaq, islamiyyəti qəbul etmək, küfr əlaməti olan şeyləri deməkdən və istifadə etməkdən çəkinməkdir. Hər müsəlman küfr əlaməti olan şeyləri öyrənməli və bunlardan uzaq durmalıdır. İmanı olan insana **“Müsəlman”** deyilir.

2 - Bədən ilə və ya qəlb ilə edilən və qadağan olan ibadət bilgiləridir. Əmr edilən bilgilərə **“Fərz”**, qadağan olanlara **“Haram”** deyilir. Bunlara **“Fürü-din”** və ya “Əhkami-islamiyyə” yaxud **“İslamiyyət”** bilgiləri deyilir.

[Hər kəsə ilk lazım olan şey, **“Kəlimeyi-tövhid”** söyləmək və bunun mənasına inanmaqdır. Kəlimeyi-tövhid, **“Lə ilahə illəllah Muhammədün rasülullah”**dır. Bunun mənası, “Allah vardır və birdir. Muhamməd əleyhissəlam Onun Peyğəmbəridir” deməkdir. Buna inanmağa “İman etmək” və “Müsəlman olmaq” deyilir. İnanan şəxsə **“Mömin”** və **“Müsəlman”** deyilir. İman davamlı olmalıdır. Buna görə də küfrə səbəb olan əməllərdən və küfr əlaməti olan şeyləri istifadə etməkdən çəkinmək lazımdır.

Qurani-kərim Allah kəlamıdır. Allahu təala Cəbrayıl əleyhissəlam adlı mələk vasitəsilə Qurani-kərimi Muhamməd əleyhis-

səlama göndərmişdir. Qurani-kərimin sözləri ərəbcədir, ancaq bu sözləri yan-yana düzən Allahu təaladır. Qurani-kərimdəki ərəbcə sözlər Allahu təala tərəfindən düzülmüş ayələr şəklində hərf və kəlimə kimi gəlmişdir. Bu hərf və kəlimələrin mənası ilahi kəlamı daşıyır. Bu hərflərə və kəlimələrə **"Quran"** deyilir. İlahi kəlamı göstərən mənalar da Qurandır. Bu ilahi kəlam olan Quran məxluq deyildir, Allahu təalanın başqa sifətləri kimi əzəli və əbədidir. Cəbrayıl əleyhissəlam hər il bir dəfə gəlib, o ana qədər enmiş olan Qurani-kərimi Lövhil-məhfuzdakı sırasına görə oxuyar, Peyğəmbərimiz də təkrar edərdi. Axirətə təşrif edəcəyi il iki dəfə gəlib, hamısını oxudular. Peyğəmbərimiz və Əshabın çoxu Qurani-kərimin hamısını əzbərləmişdilər. Axirətə təşrif etdiyi il xəlifə Əbu Bəkri Siddiq əzbər bilənləri toplayıb, yazılı olanları gətirdərək, bir heyətə bütün Qurani-kərimi yazdırmışdı. Beləliklə, **"Mushaf"** adlanan bir kitab meydana gəlmişdir. Otuz üç min səhabə bu mushafın hər hərfinin tam yerində olduğuna yekdilliklə qərar vermişdir.

Muhamməd əleyhissəlamın sözlərinə **"Hədisi-şərif"** deyilir. Bunlardan mənası Allahu təala tərəfindən, sözləri Muhamməd əleyhissəlam tərəfindən olan hədisi-şəriflərə **"Hədisi qüdsi"** deyilir. Hədis kitabları çoxdur. Bunlardan **"Buxari"** və **"Müslim"** kitabları məşhurdur.

Allahu təalanın əmrlərindən inanmaq lazım olan bilgilərə **"İman"**, əməl etmək lazım olanlara **"Fərz"**, qadağan olunanlara **"Haram"** deyilir. Fərzlərə və haramlara **"Əhkamı-islamiyyə"** deyilir. İslam bilgilərindən birinə belə inanmayana **"Kafir"** deyilir.

İnsana ikinci lazım olan şey qəlbini təmizləməkdir. Qəlb dedikdə iki şey başa düşülür. Sinəmizdə olan ət parçasına hər kəs qəlb deyir. Ürək adlanan bu qəlb heyvanlarda da vardır. İkinci qəlb ürəkdə olan, görülə bilməyən qəlbdir. Bu qəlbə "könül" deyilir. Din kitablarında yazılı olan qəlb bu könüldür. İslam bilgilərinin yeri bu qəlbdir. İnanan və inanmayan da bu qəlbdir. İnanan qəlb təmizdir, inanmayan qəlb pisdir, ölüdür. Qəlbin təmiz olması üçün çalışmaq bizim birinci vəzifəmizdir. İbadət etmək, xüsusilə də namaz qılmaq və istiğfar etmək qəlbi təmizləyər. Haram iş görmək isə

qəlbi qaraldar. Peyğəmbərimiz buyurdu ki, **“Çox istiğfar oxuyun! İstiğfar duasını oxumağa davam edəni, Allahu təala xəstəliklərdən və hər bir dərddən qoruyar. Heç ummadığı yerdən ona ruzi yetirər”**. İstiğfar **“Əstağfirullah”** deməkdir. Duaların qəbul olması üçün oxuyan adam, müsəlman olmalı, günahlarına tövbə etməli, mənasını bilərək və inanaraq deməlidir. Qaralmış qəlblə edilən dua qəbul olmaz. Üç dəfə dua oxuyanın və beş vaxt namaza davam edənin qəlbi də təmizlənər və deməyə başlayar. Qəlb demədən yalnız ağız ilə edilən duanın faydası olmaz.

İslam dininin bildirdiyi din bilgiləri **“Əhli-sünnət”** alimlərinin kitablarında yazılmış bilgilərdir. Əhli-sünnət alimlərinin bildirdikləri iman və islam bilgiləri arasında mənaları açıq olan **“nasslar”**dan, yəni ayəti-kərimələrdən və hədisi-şəriflərdən birinə inanmayan insan **“Kafir”** olar. İnanmadığını gizləyən insan, **“Münafiq”**dir. Həm gizləyib, həm də müsəlman görünərək müsəlmanları aldatmağa çalışan insan **“Zındıq”**dır. Mənası açıq olmayan nassları yanlış şərh edərək, səhv inanan, kafir olmaz. Ancaq Əhli-sünnətin doğru yolundan ayrıldığı üçün Cəhənnəmə girəcəkdir. Bu şəxs, mənası açıq olan nasslara inandığı üçün əzabda əbədi qalmayacaq, Cəhənnəmdən çıxarılacaq və Cənnətə salınacaqdır. Bunlara **“Bidət əhli”** və ya **“Dəlalət firqələri”** deyilir. Yetmiş iki cür dəlalət firqəsi vardır. Bunların, kafirlərin və mürtədlərin etdikləri ibadətlərin, insanlara etdikləri yaxşılıqların və xidmətlərin heç biri qəbul edilməyəcək və axirətdə işə yaramayacaqdır. Etiqadı doğru olan müsəlmanlara **“Əhli-sünnət vəl-camaat”** və ya **“Sünni”** deyilir. Sünni olanlar ibadət etməkdə dörd məzhəbə ayrılmışdır. Bu dörd məzhəbdə olanlar bir-birlərinin Əhli-sünnət olduqlarını bilir və bundan narahat olmurlar. Dörd məzhəbdən birində olmayan kəs Əhli-sünnət deyil. Əhli-sünnət olmayanın da yanlış yolda olacağı İmam Rəbbaninin məktublarında, xüsusilə də birinci cildin 286-cı məktubunda və **“Dürrül-muxtar”**ın Təhtavi haşiyəsinin **“Zəbayih”** hissəsində və **“Əl-bəsair li-münkirit-təvəssüli bi-əhlil-məqabir”** kitabında dəlillərlə yazılmışdır. Bu iki kitab ərəbcədir. İkincisi, Hindistanda yazılıb və çap olunmuş, 1395-ci [m.

1975] ildə və daha sonra İstanbulda Hakikat Kitabevi tərəfindən ofset üsulu ilə bir çox nəşri həyata keçirilmişdir.

Dörd məzhəbdən birinə uyğun ibadət edənlər günah iş görsələr və ya ibadətlərində qüsur etsələr, sonra da tövbə etsələr, günahları bağışlanar. Tövbə etməsələr, Allahu təala onları istərsə bağışlayar, Cəhənnəmə heç salmaz. İstərsə, günahları qədər əzab etsə də, yenə əzabdan qurtulacaqlar. Dində zəruri məlum olan, yəni cahillərin belə eşitmiş olduğu, açıq bilgilərdən birinə belə inanmayanlar Cəhənnəmdə əbədi əzab görəcəklər. Bunlara **"Kafir"** və **"Mürtəd"** deyilir.

Kafirlər kitablı və kitabsız olmaqla iki hissəyə ayrılırlar. Müsəlman övladı ikən, sonradan dindən çıxaraq kafir olana **"Mürtəd"** deyilir. İbni Abidin (rahimə-hullahü təala) şirk səbəbi ilə nikahı haram olanları bildirərkən buyurur ki, "Mürtəd, mülhid, zındıq, məcusi, bütpərəst, qədim Yunan fəlsəfəçiləri, münafiq, yetmiş iki firqədən həddi aşıb kafir olanlar, [Brahman, Buddist], batini, ibahi və dürzi deyilən şəxslərin hamısı kitabsız kafirdirlər". Kommunistlərlə masonlar da belədir. Xristianların və yəhudilərin, səmadan enən və sonradan dəyişdirilib pozulan **"Tövrat"** və **"İncil"** kitablarına inananları kitablı kafirdir. Bunlar hər hansı bir məxluqda **"Uluhiyyət sifəti"** olduğuna inanarsa, "Müşrik" olurlar. Allahu təalanın **"Sifəti zatiyyə"**sinə və **"Sifəti sübutiyyə"**sinə **"Uluhiyyət sifətləri"** deyilir.

Kitablı və ya kitabsız hər hansı bir kafir müsəlman olarsa, Cəhənnəmə girməkdən xilas olar. Günahsız, təmiz bir müsəlman olar, ancaq, "Sünni" bir müsəlman olmalıdır. Sünni olmaq, Əhli-sünnət alimlərindən birinin (rəhimə-humullahu təala) kitabını oxuyub, öyrənib, imanının, sözlərinin və işlərinin buna uyğun olması deməkdir. Dünyada bir insanın müsəlman olub-olmadığı zərurət olmadan, açıq olaraq dediyi sözlərindən və işlərindən başa düşülür. Bu insanın axirətə imanlı gedib-getmədiyi son nəfəsində məlum olur. Böyük günah iş görən kişi və ya qadın bir müsəlman təmiz qəlblə tövbə edərsə, günahları mütləq bağışlanar, günahsız tərtəmiz olar. **"Tövbə"**nin nə olduğu və tövbənin necə ediləcəyi haqqında elmihal kitablarında, məsələn, türkcə və ərəbcə **"İman və İslam"** və **"Səadəti əbədiyyə"** kitablarında geniş şəkildə bildirilmişdir].

# İMAN və İSLAM

Bu **"ETİQADNAMƏ"** kitabında Rəsulullahın (sallallahu aleyhi və səlləm) **"İmanı və islamı"** bildirən bir hədisi-şərifi açıqlanacaqdır. Bu hədisi-şərifin bərəkəti ilə müsəlmanların etiqadlarının tamamlanacağını [güclənəcəyini], beləliklə, fəzilət və səadətə qovuşacaqlarını və qəbahəti, günahı çox olan bu Xalidin də (qüddisə sirruh) qurtulmasına səbəb olacağını ümid edirəm.

Heç bir şeyə möhtac olmayan, kərəmi, ehsanı bol olan və qullarına çox rəhm edən Allahu təalaya gözəl etiqadım belədir ki, sərmayəsi az, qəlbi qara olan bu fəqir Xalidin yersiz sözlərini bağışlasın və qüsurlu ibadətlərini qəbul etsin! Yalançı və aldadan şeytanın pisliklərindən [və islam düşmənlərinin yalan-yanlış sözlərinə və yazılarına aldanmaqdan] qoruyaraq şad etsin. Mərhəmətlilərin ən mərhəmətlisi və ehsan sahiblərinin ən səxavətlisi ancaq Allahu təaladır.

İslam alimləri buyurdu ki, **"Mükəlləf"** olan, yəni aqil və büluğ olan hər bir qadın və kişi hər müsəlman [Allahu təalanı tanımalı, bilməli, yəni] Allahu təalanın sifəti-zatiyyəsini və sifəti-sübutiyyəsini doğru bilməli və inanmalıdır. Hər kəsə ilk fərz olan şey budur, bilməmək üzr deyil, günahdır. Əhməd oğlu Xalidi Bağdadinin bu kitabı yazması, başqalarından üstün olmaq və onlara bilgi satmaq, şöhrət sahibi olmaq üçün deyil, bir yadigar, bir xidmət üçündür. Allahu təala bu aciz olan Xalidə[1] və bütün müsəlmanlara öz gücü ilə və Rəsulunun mübarək ruhunun yardımı ilə imdad etsin, Amin!

[Allahu təalanın **"Sifəti-zatiyyə"**si altıdır. Bunlar: **Vücud, Qıdəm, Bəqa, Vəhdaniyyət, Müxalifətün lil-havadis** və **Qiyamü bi-nəfsihi-**dir. Vücud, öz-özünə var olmaqdır. Qıdəm, varlığının əvvəli, başlanğıcı olmamaqdır. Bəqa, varlığı əbədi olmaqdır, heç yox olmamaqdır. Vəhdaniyyət, heç bir cəhətdən şəriki, naziri və bənzəri olmamaqdır. Müxalifətün lil-havadis, heç bir şeydə, heç bir məxluqa, heç bir cəhətdən bənzəməməkdir. Qiyamü bi-nəfsi-

---

[1] Xalidi Bağdadi 1242-ci (m. 1826) ildə Şamda vəfat etmişdir.

hi, varlığı özündəndir, daima var olması üçün heç bir şeyə möhtac deyildir, deməkdir. Bu altı sifətin heç biri məxluqların heç birində yoxdur. Bunların məxluqlara heç bir surətdə əlaqələri və bağlılıqları da yoxdur. Bəzi alimlər Vəhdaniyyət və Müxalifətün lil-havadisin eyni olduqlarını deyərək, **“sifəti-zatiyyə beşdir”** demişdirlər].

Allahu təaladan başqa olan hər şeyə, **“Ma-siva”** və ya **“Aləm”** deyilir. Dövrümüzdə **“Təbiət”** deyirlər. Aləmlərin hamısı yox idi, hamısını Allahu təala yaratdı. Aləmlərin hamısı mümkündür və hədisdir. Yəni, yox ikən var ola bilər, var ikən yox ola bilər və yox ikən var olmuşdurlar. **“Allahu təala var idi, heç bir şey yox idi”** hədisi-şərifi bunu bildirir.

Aləmin hədis olduğunu göstərən ikinci bir dəlil də aləmin hər zaman pozularaq dəyişməsidir. Hər şey dəyişməkdədir. Qədim olan şey isə əsla dəyişməz. Allahu təalanın zatı [yəni özü] və sifətləri belədir, bunlar heç vaxt dəyişməz. [Halbuki aləmdə, fiziki hadisələrdə, maddələrin hal dəyişdirməsi olur. Kimyəvi reaksiyalarda maddələrin əsası, quruluşu dəyişir. Cisimlərin yox olaraq başqa cisimlərə çevrildiyini görürük. Müasir dövrdə yeni bilinən atom dəyişmələrində və nüvə reaksiyalarında maddə və element də yox olaraq, enerjiyə çevrilir]. Aləmlərin belə dəyişməsi, bir-birindən əmələ gəlməsinin mütləq bir başlanğıcı olmalıdır. Sonsuzdan gəlməyən, yoxdan var edilmiş olan ilk maddələrdən, elementlərdən hasil olması lazımdır.

Aləmin mümkün olduğuna, yəni yox ikən var ola biləcəyinə başqa bir dəlil də, aləmin hədis olmasıdır. Yəni, hər şeyin yox ikən var olmasıdır. [Vücud, var olmaq deməkdir. Üç cür vücud vardır: Birincisi **“Vacibül-vücud”**dur. Yəni, varlığı lazım olan vücuddur, daim vardır. Əvvəli və sonsuz sonraları heç vaxt yox ola bilməz. Yalnız Allahu təala vacibül-vücuddur. İkincisi, **“Mümtəniül-vücud”**dur. Yəni, var ola bilməz. Daim yox olması lazımdır. Şəriki-bari belədir. Yəni, Allahu təalaya ortaq, Allahu təala kimi ikinci bir tanrı var ola bilməz. Üçüncüsü, **“Mümkünül-vücud”**dur. Yəni, var ola da bilər, yox ola da bilər. Bütün aləmlərin və məxluqların hamısı belədir. **“Vücud”** sözünün əksi **“Adəm”** sözüdür. Adəm

yoxluq deməkdir. Aləmlər, yəni hər şey var olmadan əvvəl adəmdə idi, yəni yox idilər].

Mövcud, yəni, var olan şey iki cürdür: Biri **"Mümkün"**, ikincisi **"Vacib"**dir. Əgər mövcud yalnız mümkün olsaydı və vacibul-vücud olmasaydı, heç bir şey var ola bilməzdi. [Çünki yox ikən var olmaq bir dəyişiklikdir, bir hadisədir. Fizika elmindən bilindiyi kimi, hər cisimdə bir hadisə olması üçün bu cismə xaricdən bir gücün təsir etməsi, bu güc qaynağının bu cisimdən əvvəl mövcud olması lazımdır]. Buna görədir ki, mümkün olan mövcud öz-özünə var ola bilməz və varlıqda qala bilməz. Ona bir qüvvə təsir etməsəydi, daim yoxluqda qalardı, var ola bilməzdi. Özünü var edə bilməyən bir şey, başqa mümkünləri də, əlbəttə, xəlq edə bilməz, yarada bilməz. Mümkünü yaradan vacibül-vücud olmalıdır. Aləmin var olması, bunu yoxdan var edən bir yaradıcının var olduğunu göstərir. Görünür ki, hədis və mümkün olmayaraq, yəni daim var olaraq, bütün mümkünlərin tək yaradıcısı, ancaq vacibül-vücuddur. O, qədimdir, yəni daima var idi. Vacibül-vücud, vücudu başqasından deyil, ancaq özündəndir. Yəni öz-özünə daima vardır, başqası tərəfindən yaradılmamışdır. Əgər belə olmazsa, mümkün və hədis olması, başqası tərəfindən yaradılması lazım olardı. Bu isə düşünülənin əksinə olan bir nəticədir. Farsca **"Xuda"** demək, öz-özünə daima var olan, yəni qədim deməkdir.

Aləmlərin heyrətamiz bir nizam içində olduqlarını görürük. Fənn hər il bunların yenilərini kəşf edir. Bu nizamı yaradanın **"Hayy"** diri, **"Alim"** bilən, **"Qadir"** gücü çatan, **"Mürid"** diləyən, **"Səmi"** eşidən, **"Bəsir"** görən, **"Mütəkəllim"** söyləyən və **"Xaliq"** yaradan olması lazımdır. Çünki ölmək və cahil olmaq, gücü çatmamaq, bir işi güclə yerinə yetirmək, karlıq, korluq və danışa bilməmək bir qüsurdur və utanılası şeylərdir. Bu kainatı, bu aləmi bu nizamla yaradanın və yox olmaqdan qoruyanın belə qüsurlu sifətləri ola bilməz.

[Atomdan ulduzlara qədər hər varlıq bir hesabla və qanunla yaradılmışdır. Fizika, kimya, astronomiya və biologiyanın kəşf edilmiş qanunlarında və onlar arasındakı əlaqələrdə olan nizam

ağılları heyrətləndirir. Darvin belə, "Gözün quruluşundakı nizamı, incəlikləri düşündükcə, heyrətdən ağlım başımdan çıxır" demək məcburiyyətində qalmışdır. Hava 78% azot, 21% oksigen və 1% digər qazların qarışığından ibarətdir. Bunlar birləşmə deyil, qarışıqdır. Oksigen 21%-dən çox olsaydı ciyərlərimizi yandırardı. 21%-dən az olsaydı, qandakı qida maddələrini yandıra bilməzdi, insanlar və heyvanlar həyat olmazdı. Bu 21% miqdar hər yerdə və yağışda dəyişmir. Bu isə böyük bir nemətdir. Allahın varlığını, qüdrətini və mərhəmətini göstərmir məgər? Bu xariqənin yanında gözün quruluşu heç qalır. Fənn bilgilərində öyrənilən bütün qanunları, dəqiq hesabları və formulları yaradan varlıq, heç nöqsan sifətli olar bilərmi məgər?]

Həmçinin, sadalanan kamal sifətlərini məxluqlarda da müşahidə edirik. Bunları məxluqlarında yaratmışdır. Əgər bu sifətlər özündə olmasaydı, məxluqlarda necə yarada bilərdi? Özündə olmasaydı, məxluqları Ondan daha üstün olardı.

Yenə deyirik ki, aləmləri yaradanda bütün kəmal, üstün sifətlər olmalı və nöqsan sifətlərdən heç biri olmamalıdır. Çünki nöqsan, qüsurlu olan Xuda, yaradıcı ola bilməz. Ağlın bildirdiyi bu dəlilləri bir tərəfə qoysaq, ayəti-kərimələr və hədisi-şəriflər də Allahu təalanın kamal sifətləri olduğunu açıq şəkildə bildirir. Bunda şübhə etmək caiz deyildir. Şübhə etmək küfrə səbəb olar. Yuxarıda yazılmış səkkiz kəmal sifətinə **"Sifəti sübutiyyə"** deyilir. Yəni, Allahu təalanın səkkiz sifəti-sübutiyyəsi və bütün kəmal sifətləri vardır. Onun zatında, sifətlərində və işlərində heç bir qüsur, qarışıqlıq və dəyişiklik yoxdur. **"Sifəti-zatiyyə"** və **"Sifəti-sübutiyyə"**yə **"Uluhiyyət sifətləri"** deyilir. Bir məxluqda uluhiyyət sifəti olduğuna inanan adam **"Müşrik"** olur.

## İSLAMIN ŞƏRTLƏRİ

Bütün aləmləri hər an varlıqda saxlayan və hər an hazır və nazir olan, bütün yaxşılıqları və nemətləri verən Allahu təalanın yardımı ilə indi Peyğəmbərimizin (sallallahu aleyhi və səlləm) mübarək sözünü izah etməyə başlayırıq.

Müsəlmanların qəhrəman İmamı, Əshabı-kiramın yüksəklərindən olan, daim doğru danışan, məşhur sevgili böyüyümüz Ömər ibn Xəttab (radıyallahu anh) buyurur ki: “O gün elə bir gün idi ki, Əshabı-kiramdan bir neçə nəfər Rəsulullahın (sallallahu aleyhi və səlləm) hüzurunda və xidmətində idik”. Həmin gün, həmin saat elə şərəfli, elə qiymətli və bir daha heç vaxt ələ keçməz bir gün idi. O gün Rəsulullahın söhbətində, yanında olmaqla şərəflənmək ruhlara qida olan, canlara zövq və səfa verən mübarək camalını görmək nəsib olmuşdu. Bu günün şərəfini, qiymətini izah edə bilmək üçün, “Elə bir gün idi ki...” buyurmuşdu. Cəbrayıl əleyhissəlamı insan cildində görmək, onun səsini eşitmək, qulların möhtac olduğu bilgini çox gözəl və açıq bir şəkildə Rəsulullahın (sallallahu təala aleyhi və səlləm) mübarək ağzından eşitmək nəsib olan bir gün kimi şərəfli və qiymətli bir vaxt tapılarmı məgər? “O vaxt ay çıxmış kimi bir şəxs yanımıza gəldi. Paltarları çox ağ, saçları da həddindən artıq qara idi. Üzərində toz-torpaq və tər kimi səfər əlamətləri görünmürdü. Rəsulullahın (sallallahu aleyhi və səlləm) Əshabı olan bizlərdən heç birimiz onu tanımırdıq. Yəni, görüb-tanıdığımız adamlardan biri deyildi. Rəsulullahın (sallallahu aleyhi və səlləm) hüzurunda oturdu. Dizlərini mübarək dizlərinə yaxınlaşdırdı”. Bu gələn Cəbrayıl adlı mələk idi, insan cildinə girmişdi.

Cəbrayıl əleyhissəlamın belə oturuşu ədəbə zidd görünsə də, bu halı mühüm bir şeyi bildirməkdədir. Yəni, dini məlumatları öyrənmək üçün utanmağın doğru olmadığını və ustada qürur və təkəbbürün yaraşmayacağını göstərir. Hər kəsin dində öyrənmək istədiklərini müəllimlərdən sərbəst bir şəkildə və çəkinmədən soruşması lazım gəldiyini Cəbrayıl əleyhissəlam Əshabı-kirama bu

halı ilə bildirir. Çünki, din öyrənməkdə utanmaq və Allahu təalanın haqqını ödəməkdə, öyrətməkdə və öyrənməkdə sıxılmaq doğru olmaz.

"O zati-şərif əllərini Rəsuli-əkrəmin (sallallahu aleyhi və səlləm) mübarək dizlərinin üstünə qoydu. Rəsulullahdan soruşaraq, **"Ya Rəsulallah! Mənə islamiyyəti, müsəlmanlığı izah et"**, dedi". **"İslam"** - lüğətdə, boyun bükərək təslim olmaq deməkdir. Rəsulullah (sallallahu aleyhi və səlləm) islam sözünün, islamiyyətdə beş təməl dirəyin adı olduğunu belə izah etdi:

Rəsuli-əkrəm (sallallahu aleyhi və səlləm) buyurdu ki:

1 - İslamın şərtlərindən birincisi, **"Kəlimeyi-şəhadət gətirməkdir"**. Kəlimeyi-şəhadət gətirmək, **"Əşhədü ən la ilahə illallah və əşhədü ənnə Muhəmmədən abdühü və rasulüh"** deməkdir. Yəni, aqil və büluğ olan, danışa bilən hər kəsin, **"Yerdə və göydə Ondan başqa ibadət edilməyə haqqı olan və sitayiş edilməyə layiq olan heç bir şey və heç bir kəs yoxdur. Həqiqi məbud ancaq Allahu təaladır"**. O, vacibül-vücuddur, hər üstünlük Ondadır. Onda heç bir qüsur yoxdur. Onun adı **"Allah"**dır deməsi və buna qəlb ilə qəti olaraq inanmasıdır. Yenə, O, gül rəngli, qırmızımtıl, parlaq, sevimli üzlü, qara qaşlı, qara gözlü, mübarək alnı açıq, gözəl xasiyyətli, kölgəsi yerə düşməyən və şirin sözlü, Ərəbistanda, Məkkədə doğulduğu üçün Ərəb adlanan, Haşimi övladından **"Abdullahın oğlu Muhamməd adlı zatı ali, Allahu təalanın qulu və rəsuludur, yəni Peyğəmbəridir".** Vəhəbin qızı həzrəti Əminənin oğludur. [Miladın 571-ci ilinin, Aprel ayının 20-si Bazar ertəsi səhəri, dan yeri ağararkən] Məkkə şəhərində dünyaya təşrif etdi. Qırx yaşında ikən Peyğəmbər olduğu Ona bildirildi. Bu ilə **"Bisət ili"** deyilir. Bundan sonra on üç il Məkkədə insanları İslam dininə dəvət etdi. Allahu təalanın əmri ilə Mədinə şəhərinə hicrət etdi. Burada islamiyyəti hər tərəfə yaydı. Hicrətdən on il sonra, yəni miladın 632-ci ilinin İyun ayında, Rəbiul-əvvəlin on ikisi Bazar ertəsi günü Mədinədə vəfat etdi. [Tarixçilərə görə, Məkkəyi-mükərrəmədən Mədinəyi-münəvvərə şəhərinə hicrəti zamanı miladi 622-ci ildə Səfər ayının 27-si Cümə axşamı günü axşama

yaxın Sevr dağındakı mağaraya girdi. Bazar ertəsi gecəsi mağaradan çıxıb, Frəngi Sentyabr ayının 20-si, Rumi Sentyabır ayının 27-si və Rəbiul-əvvəlin 8-i Bazar ertəsi günü Mədinə şəhərinin Kuba kəndinə daxil oldu. Bu məsud gün, müsəlmanların **“Hicri şəmsi”** ilinin başlanğıcı oldu. Şiələrin hicri şəmsi il başlanğıcı bundan altı ay əvvəldir. Yəni, atəşə sitayiş edən məcusi kafirlərin bayramları olan Martın 20-ci günü başlayır. Gecə ilə gündüzün bərabər olduğu Cümə axşamı günü də Kubada qalıb, Cümə günü oranı tərk etdi. O gün Mədinəyə təşrif etdi. O ilin Məhərrəm ayının birinci günü də, **“Hicri qəməri”** il başlanğıcı qəbul edildi. Bu qəməri ilin başlanğıcı, İyul ayının 16-sı Cümə günü idi. Hər hansı bir miladi il başlanğıcının üst-üstə düşdüyü hicri şəmsi il, bu miladi ildən 622 il azdır. Hər hansı bir hicri şəmsi ilin başlanğıcının üst-üstə düşdüyü miladi il, bu şəmsi ildən 621 il çoxdur].

2 - İslamın beş şərtindən ikincisi, şərtlərinə və fərzlərinə uyğun olaraq hər gün beş dəfə **“Vaxtı gəldikdə, namaz qılmaqdır”**. Hər müsəlmanın hər gün vaxtı gəldikdə beş dəfə namaz qılması və hər birini vaxtında qıldığını bilməsi fərzdir. Cahillərin və məzhəbsizlərin hazırladıqları yanlış təqvimlərə riayət edərək vaxtından əvvəl qılmaq böyük günahdır və bu namaz səhih olmaz. Həm də zöhr namazının ilk sünnətinin və şam namazının fərzinin kərahət vaxtında qılınmasına səbəb olur. [Namaz vaxtının girdiyi müəzzinin azan oxuması ilə məlum olur. Kafirlərin, bidət əhlinin oxuduğu və səsucaldıcı kimi cihazların əmələ gətirdiyi **“Azanı-Muhəmmədi”** deyildir]. Namazları fərzlərinə, vaciblərinə, sünnətlərinə diqqət edərək və könlünü Allahu təalaya verərək vaxtları keçmədən qılmaq lazımdır. Qurani-kərimdə namaza **“Salət”** deyilir. Salət: lüğətdə insanın dua etməsi, mələklərin istiğfar etməsi, Allahu təalanın mərhəmət etməsi, rəhm etməsi deməkdir. İslamiyyətdə **“Salət”** - elmihal kitablarında bildirildiyi şəkildə müəyyən hərəkətləri etmək və müəyyən şeyləri oxumaq deməkdir. Namaz qılmağa **“İftitah təkbiri”** ilə başlanılır. Yəni, kişilərin əllərini qulaqlarına qədər qaldırıb göbək altına və qadınların əllərini çiyinlərinə qədər qaldırıb sinə üstünə qoyarkən **“Allahu əkbər”** demələri

ilə başlanılır. Son oturuşda başı sağ və sol çiyinlərə çevirib, salam verərək bitirilir.

3 - İslamın beş şərtindən üçüncüsü, **“Malın zəkatını verməkdir”**. Zəkatın lüğət mənası təmizlik, tərifləmək və yaxşı, gözəl vəziyyətə gəlmək deməkdir. İslamiyyətdə zəkat - ehtiyacdan artıq və **“Nisab”** adlanan müəyyən bir məbləğ miqdarında **“Zəkat malı”** olan hər kəsin malının müəyyən miqdarını ayırıb, Qurani-kərimdə bildirilən müsəlmanlara minnət qoymadan verməsi deməkdir. Zəkat yeddi qrup insana verilir. Dörd məzhəbdə də dörd növ zəkat malı vardır: Qızıl və gümüşün zəkatı, ticarət malının zəkatı, ilin yarıdan çoxunu otlaqlarda otlayan dördayaqlı ətlik heyvanların zəkatı və torpaqdan əldə edilən məhsulların zəkatıdır. Bu dördüncü zəkata **“Uşr”** deyilir. Yerdən məhsul alınan kimi uşr verilməlidir. Digər üç zəkat nisab miqdarı tamam olduqdan bir il sonra verilir.

4 - İslamın beş şərtindən dördüncüsü, **“Ramazani-şərif ayında hər gün oruc tutmaqdır”**. Oruc tutmağa **“Səvm”** deyilir. Səvm, lüğətdə bir şeyi başqa şeydən qorumaq deməkdir. İslamiyyətdə, şərtlərinə riayət edərək Ramazan ayında Allahu təala əmr etdiyi üçün hər gün üç şeydən özünü qorumaq deməkdir. Bu üç şey: yemək, içmək və cimadır. Ramazan ayı göydə hilalı [yeni ayı] görməklə başlayır, təqvimlə əvvəlcədən hesablamaqla başlamaz.

5 - İslamın beş şərtindən beşincisi, **“Gücü çatanın ömründə bir dəfə həccə getməsidir”**. Yolun etibarlı və bədənin sağlam olması şərtilə, Məkkəyi-mükərrəmə şəhərinə gedib gələnə qədər tərk etdiyi ailəsini dolandırmağa kifayət edəcək qədər maldan artıq qalan pulla oraya gedib gələ biləcək hər kəsin ömründə bir dəfə Kəbəyi-müəzzəməni təvaf etməsi və Ərafat meydanında durması fərzdir.

O şəxs Rəsulullahdan bu cavabları eşitdikdə, **“Düz dedin ya Rəsulallah”** dedi. Ömər (radıyallahu anh) xəbər verir ki, Əshabı-kiramdan orada olanlar o şəxsin bu halına heyrət etdilər. Çünki həm soruşur, həm də verilən cavabın doğru olduğunu təsdiq edirdi. Bir şeyi soruşmaq bilmədiyini öyrənməyi istəmək deməkdir. Doğru dedin demək isə bunları bildiyini göstərir.

Yuxarıda bildirilən islamın beş şərtindən ən üstünü “Kəlimeyi-şəhadət” söyləmək və mənasına inanmaqdır. Bundan sonra üstünü namaz qılmaqdır. Daha sonra oruc tutmaq, daha sonra həccə getməkdir. Ən axırda isə zəkat verməkdir. Kəlimeyi-şəhadətin ən üstün olduğu yekdilliklə məlumdur. Alimlərin çoxunun sözünə görə, qalan dördünün üstünlük sırası yuxarıda bildirdiyimiz kimidir. Müsəlmanlığın başlanğıcında ilk fərz Kəlimeyi-şəhadət oldu. Beş vaxt namaz, bisətin on ikinci ilində, hicrətdən bir il və bir neçə ay əvvəl Merac gecəsində fərz oldu. Ramazanı-şərif orucu hicrətin ikinci ilində, Şaban ayında fərz oldu. Zəkat vermək, orucun fərz olduğu il, Ramazan ayı içərisində fərz oldu. Həcc isə hicrətin doqquzuncu ilində fərz oldu.

Bir şəxs islamın bu beş şərtindən birini inkar etsə, yəni inanmasa, qəbul etməsə, yaxud ələ salıb hörmət göstərməsə, nəuzubillah, kafir olar. Bunlar kimi halal və haram olduğu açıq olaraq və yekdilliklə bildirilmiş olan başqa şeylərdən birini də qəbul etməyən, yəni halala haram deyən və ya harama halal deyən də kafir olar. Dində zəruri məlum olan, yəni islam ölkəsində yaşayan cahillərin belə eşitdiyi və bildiyi dini bilgilərdən birini inkar edən, bəyənməyən kafir olar.

[Məsələn, donuz əti yemək, alkoqollu içki içmək, qumar oynamaq və qadınların, qızların başları, saçları, qolları və ayaqları açıq, kişilərin də dizləri ilə göbək arası açıq olaraq başqasının yanına çıxmaları haramdır. Yəni, Allahu təala bunları qadağan etmişdir. Allahu təalanın əmrlərini və qadağalarını bildirən dörd haqq məzhəb, kişilərin övrət yerlərini, yəni baxması və başqasına göstərməsi qadağan edilmiş olan üzvlərini fərqli olaraq bildirmişlər. Hər müsəlmanın tabe olduğu məzhəbin bildirdiyi övrət yerini örtməsi fərzdir. Bu yerləri açıq olanlara başqalarının baxmaları haramdır. **“Kimyayi-səadət”**də deyilir ki, “Qadınların, qızların başı, saçı, qolları, ayaqları açıq küçəyə çıxmaları haram olduğu kimi, nazik, bəzəkli, dar, xoş ətirli paltarla çıxmaları da haramdır. Belə bir şəkildə çıxmalarına icazə verən, razı olan, bəyənən anası, atası, həyat yoldaşı və qardaşı da onun günahına və əzabına ortaq olur-

lar”. Yəni, Cəhənnəmdə birlikdə yanacaqlar. Əgər, tövbə etsələr, bağışlanar və yanmazlar. Allahu təala tövbə edənləri sevər. Aqil və büluğ olan qızların və qadınların yad kişilərə görünməmələri hicrətin üçüncü ilində əmr olundu. İngilis cəsuslarının və bunların tələlərinə düşmüş cahillərin hicab ayəsi gəlmədən əvvəl olan örtünməməyi ortaya ataraq örtünməyi sonradan fəqihlər özlərindən çıxartdılar demələrinə aldanmayaq.

Müsəlman olduğunu deyən hər kəsin, edəcəyi hər işin islamiyyətə uyğun olub-olmadığını bilməsi lazımdır. Bilmirsə, bir Əhli-sünnət alimindən soruşaraq və ya bu alimlərin kitablarından oxuyaraq öyrənməlidir. İş islamiyyətə uyğun deyilsə, günah və ya küfrdən xilas ola bilməz. Hər gün həqiqi tövbə etmək lazımdır. Tövbə edilən günah və küfr mütləq bağışlanar. Tövbə edilməzsə, dünyada və Cəhənnəmdə əzabını, yəni cəzasını çəkər. Bu cəzalar kitabımızın müxtəlif yerlərində yazılmışdır. Böyük günah işləyən hər bir müsəlman günahı qədər yandıqdan sonra Cəhənnəmdən çıxarılacaqdır. Allahu təalaya inanmayan və islamiyyətin yox olması üçün çalışan kafir, zındıq Cəhənnəmdə əbədi yanacaqdır.

Kişilərin və qadınların namazda və hər yerdə örtməsi lazım olan yerlərinə **“Övrət yeri”** deyilir. Övrət yerini açmaq və başqasının övrət yerinə baxmaq haramdır. İslamiyyətdə övrət yeri yoxdur deyən kafir olar. İcma ilə, yəni dörd məzhəbdə də övrət olan bir yerini açmağa və başqalarının belə övrət yerinə baxmağa halal deyən, əhəmiyyət verməyən, yəni əzabından qorxmayan kafir olar. Qadınların övrət yerini açmaları və kişilərin yanında mahnı və mövlud oxumaları da buna aiddir. Kişilərin diz ilə qasıqları arası Hənbəli məzhəbində övrət deyildir.

“Mən müsəlmanam” deyən hər kəs, imanın və islamın şərtlərini, dörd məzhəbin icması, yəni yekdilliklə bildirdiyi fərzləri, haramları öyrənməli və əhəmiyyət verməlidir. Bilməmək üzrlü səbəb deyildir. Yəni, bu bilib inanmamaq kimidir. Qadınların üzlərindən və əllərindən başqa hər yerləri dörd məzhəbdə də övrətdir. İcma ilə olmayan, yəni digər üç məzhəbdən birinə görə övrət sayılmayan bir yerini əhəmiyyət verməyərək açan qadın kafir olmasa da, öz

məzhəbinə görə böyük günaha girər. Kişilərin diz ilə qasıq arasını, yəni dizini açmaları belədir. Bilmədiyini öyrənmək fərzdir. Öyrəndikdə dərhal tövbə etmək və örtmək lazımdır.

Yalan danışmaq, dedi-qodu, qeybət, iftira, oğurluq, hiylə, xəyanət, qəlb qırmaq, fitnə çıxarmaq, başqasının malını ondan icazəsiz götürmək, işçinin, muzdlunun haqlarını verməmək, dövlətə üsyan etmək, yəni qanunlarına, hökumətin əmrlərinə qarşı çıxmaq, vergiləri ödəməmək də günahdır. Bunları kafirlərə qarşı da, kafir ölkəsində də etmək haramdır. Cahillərin bilməyəcəyi qədər məşhur və zəruri olmayan şeyləri cahillərin bilməməsi küfr olmaz. Fasiqlik, yəni günah olar].

## İMANIN ŞƏRTLƏRİ

"Bu şəxs yenə soruşaraq, ya Rəsulallah (sallallahu təala aleyhi və səlləm)! **"İmanın nə olduğunu da mənə bildir"** dedi". İslamın nə olduğunu soruşduqdan və cavab verildikdən sonra Cəbrayıl (əleyhissəlam) Rəsuli-əkrəmdən (sallallahu aleyhi və səlləm) imanın həqiqətini və mahiyyətini izah etməsini istədi. İman - lüğətdə bir kəsi tamamilə doğru sözlü bilmək, ona inanmaq deməkdir. İslamiyyətdə iman - Rəsuli-əkrəmin (sallallahu aleyhi və səlləm) Allahu təalanın Peyğəmbəri olduğunu və Onun tərəfindən seçilmiş, xəbər verici nəbi olduğunu doğru bilmək və inanaraq demək, Onun Allahu təala tərəfindən qısaca bildirdiklərinə qısaca inanmaq və geniş bildirdiklərinə ətraflıca inanmaq, gücü çatdıqca Kəlimeyi-şəhadəti dil ilə də söyləməkdir. Atəşin yandırdığına, ilanın zəhərləyib öldürdüyünə dəqiqliklə inanıb qaçdığı kimi, könüldən tam olaraq, Allahu təalanı və sifətlərini böyük bilərək inanmaq, Onun rizasına və camalına can atmaq, qəzəbindən, əzabından qaçmaq və imanı mərmər üzərində yazılan yazı kimi sağlam olaraq könlünə yerləşdirmək, güclü imanın əlamətidir.

Muhamməd əleyhissəlamın bildirdiyi iman ilə islam birdir. Kəlimeyi-şəhadətin mənasına inanmaq hər ikisində də vardır. Bəzi

ümumi və xüsusi fərqləri olsa da, lüğət mənalarının fərqli olmasıyla yanaşı, islamiyyətdə fərqləri yoxdur.

İman tək bir şeydir, yoxsa bir neçə hissədən meydana gəlir? Birləşikdirsə, neçə hissədən ibarətdir? Əməllər, ibadətlər imandandır, yoxsa imandan deyildir? İmanım var deyərkən, inşaallah demək caizdir, yoxsa yox? İmanda azlıq-çoxluq varmı? İman məxluqdurmu? İman etmək insanın əlindədir, yoxsa möminlər zorla iman etmişdir? Əgər imanda məcburiyyət varsa, hər kəsin iman etməsi niyə əmr olunmuşdur? Bunları ayrı-ayrı bildirmək çox uzun çəkər. Ona görə də hər birinin cavabını burada ayrı-ayrı bildirməyəcəyəm. Ancaq bu da bilinməlidir ki, Əşari və Mötəzilə məzhəblərinə görə mümkün olmayan bir şeyin icrasını Allahu təalanın əmr etməsi caiz deyildir. Özü mümkün olsa da, insanların gücü çatmadığı şeyləri əmr etməsi də, Mötəziləyə görə caiz deyildir. Əşariyə görə isə bu caizdir, ancaq əmr etməmişdir. İnsanın havada uçmasını əmr etmək belədir. İmanda, ibadətlər və əməllərdə Allahu təala qullarından gücü çatmadığı şeyləri istəməmişdir. Buna görədir ki, müsəlman ikən dəli olan, qafil olan, yatan və ölən şəxs bu halında təsdiq etməsə də müsəlmanlıqları davam edər.

Bu hədisi-şərifdə imanın lüğət mənası düşünülməməlidir. Çünki lüğət mənası təsdiq və inanmaq olduğuna görə, ərəb cahillərindən bu mənanı bilməyən yoxdur. O ki qaldı Əshabı-kiram (radıyallahu təala anhum əcməin) bilməmiş olsunlar. Cəbrayıl əleyhissəlam imanın mənasını Əshabı-kirama öyrətmək istəyirdi. Bunun üçün Rəsulullaha (sallallahu təala aleyhi və səlləm) islamiyyətdə nəyə iman deyildiyini soruşmaqdadır. **"İman -** kəşf ilə və ya vicdanla taparaq, yaxud bir dəlil ilə ağlın anlamasıyla və ya seçilmiş, bəyənilmiş bir sözə etimad edərək və təqlid edərək məlum altı şeyə canı-könüldən inanmaq, dil ilə də təsdiq etməkdir. Rəsulullah (sallallahu aleyhi və səlləm) də, imanın məlum altı şeyə inanmaq olduğunu belə bildirdi:

1 - Bu altı şeydən birincisi, Allahu təalanın vacibul-vücud və həqiqi məbud, bütün varlıqların yaradanı olduğuna inanmaqdır. Dünya və axirət aləmində olan hər şeyi maddəsiz, zamansız

və bənzərsiz olaraq yoxdan var edən, ancaq Allahu təaladır deyə qəti inanmaqdır. [Hər maddəni, atomları, molekulları, elementləri, birləşmələri, orqanik cisimləri, hüceyrələri, həyatı, ölümü, hər hadisəni, hər reaksiyanı, hər cür gücü, enerji növlərini, hərəkətləri, qanunları, ruhları, mələkləri, canlı-cansız hər var olanı yoxdan var edən və hamısını, hər an varlıqda saxlayan yalnız Odur]. Aləmlərdə olan hər şeyi, [heç biri yox ikən, bir anda] yaratdığı kimi, [hər zaman bir-birindən də var etməkdədir. Qiyamət günü gəldikdə hər şeyi bir anda] yenə yox edəcəkdir. Hər varlığın xaliqi, yaradanı, sahibi və hakimi Odur. Onun hakimi, əmiri, üstünü yoxdur deyə inanmaq lazımdır. Hər üstünlük, hər kamal sifət Onundur. Onda heç bir qüsur, heç bir nöqsan sifət yoxdur. Dilədiyini edə bilir. Etdikləri özünə və ya başqasına faydalı olmaq üçün deyildir. Bir qarşılıq üçün etməz. Bununla yanaşı, hər işində hikmətlər, faydalar, lütflər və ehsanlar vardır.

Qullarına yaxşı və faydalı olanları verməyə, bəzisinə savab, bəzisinə əzab verməyə məcbur deyildir. Üsyankarların, günah iş görənlərin hamısını Cənnətə qoysa, fəzlinə və ehsanına yaraşar. İtaət və ibadət edənlərin hamısını Cəhənnəmə atsa, ədalətinə uyğun olar. Ancaq müsəlmanları və ibadət edənləri Cənnətə qoyacağını, onlara əbədi nemətlər və yaxşılıqlar bəxş edəcəyini, kafirlərə isə Cəhənnəmdə əbədi əzab edəcəyini diləmiş və bildirmişdir. O, sözündən dönməz. Bütün canlılar iman etsə, itaət etsə, Ona heç bir faydası olmaz. Bütün aləm kafir olsa, azğın, üsyankar olsa, qarşı çıxsa, Ona heç bir zərər verməz. Qul, bir şey etmək istədikdə, O da istəyərsə, o şeyi yaradar. Qullarının hər hərəkətini və hər şeyi yaradan Odur. O diləməsə, yaratmasa, heç bir şey hərəkət edə bilməz. O diləməsə, heç kim kafir ola bilməz. Heç kim üsyan edə bilməz. Küfrü, günahları diləsə də bunlardan razı deyildir. Onun işinə heç kim qarışa bilməz. Nə üçün belə etdi, kaş ki belə etsəydi deməyə, səbəbini soruşmağa heç kimin gücü və haqqı yoxdur. Şirkdən, küfrdən başqa hər hansı böyük günahı işləyib, tövbəsiz ölən insanı diləsə bağışlayar. Kiçik bir günahdan ötrü diləsə əzab edər. Kafir, mürtəd olaraq ölənləri qətiyyən bağışlamayacağını, bunlara əbə-

di əzab edəcəyini bildirmişdir. Müsəlman olan, yəni **"Əhli-qiblə"** olub, ibadət edən, ancaq etiqadı **"Əhli-sünnət"** etiqadına uyğun olmayan və tövbə etmədən ölən insana Cəhənnəmdə əzab edəcəksə də, belə **"Bidət sahibi"** müsəlmanlar Cəhənnəmdə əbədi qalmayacaq.

Allahu təalanı dünyada baş gözü ilə görmək caizdir, ancaq heç kim görməmişdir. Qiyamət günü məhşər yerində kafirlərə və günahı olan möminlərə, qəhr və cəlal ilə; saleh olan möminlərə isə lütf və camal ilə görünəcəkdir. Möminlər Cənnətdə Onu camal sifəti ilə görəcəklər. Mələklər və qadınlar da görəcəkdir. Kafirlər bundan məhrum qalacaqlar. Cinlərin də məhrum qalacaqlarını bildirən xəbər güclüdür. Alimlərin çoxuna görə, "Möminlərin məqbul olanları hər səhər və axşam, dərəcəsi aşağı olanlar isə hər Cümə günü, qadınlar da dünya bayramı kimi ildə bir neçə dəfə təcəlliyi-camal ilə və ruyət ilə müşərrəf olacaqlar".

[Şeyx Əbdülhaq Dəhləvi həzrətləri[1] farsca qələmə aldığı **"Təkmilul-iman"** kitabında buyurur ki: Hədisi-şərifdə buyuruldu ki, **"Qiyamət günü Rəbbinizi on dörd gecəlik ayı gördüyünüz kimi görəcəksiniz!"** Allahu təala dünyada anlaşıla bilmədiyi kimi, axirətdə də anlaşılmadan görüləcəkdir.

Əbül Həsən Əşari, imam Suyuti və imam Beyhəqı kimi böyük alimlər mələklərin də Cənnətdə Allahu təalanı görəcəklərini bildirmişlər. İmam azam Əbu Hənifə və başqa alimlər cinlərin savab qazanmayacaqlarını və Cənnətə girməyəcəklərini, ancaq mömin olanlarının Cəhənnəmdən xilas olacaqlarını bildirdilər. Qadınlar dünyadakı bayram günləri kimi ildə bir neçə dəfə görəcəklər. Möminlərin kamil olanları hər səhər və axşam, digərləri isə Cümə günləri görəcəklər. Bu fəqirə görə, mömin qadınlar, mələklər və cinlər də bu müjdəyə daxildirlər. Fatimətuz-zəhra, Xədicətul-kübra, Aişəyi-siddiqə, digər əzvaci tahirat, Məryəm və Asiyə (radıyallahu təala anhunnə əcməin) kimi kamil və arif xanımların digər qadınlardan müstəsna tutulmaları lazımdır. İmam Suyuti də buna işarə edir].

[1] Əbdülhaq Dəhləvi 1052-ci (m. 1642) ildə Dehlidə vəfat etmişdir.

Allahu təalanın görüləcəyinə inanınmalı, necə görüləcəyi düşünülməməlidir. Çünki, Allahu təalanın işləri ağılla anlaşılmaz və dünya işlərinə bənzəməz. [Fizika və kimya bilikləri ilə ölçülə bilməz]. Allahu təalanın cəhəti yoxdur. Allahu təala maddə deyildir, cisim deyildir. [Element deyildir. Formul, birləşmə deyildir]. Sayılan deyil, ölçülməz, hesablanmaz, onda dəyişiklik olmaz. Məkanlı deyildir, bir yerdə deyildir, zamanlı deyildir. Əvvəli, sonrası, önü, arxası, altı, üstü, sağı və solu yoxdur. Buna görə də insan düşüncəsi, insan bilgisi, insan ağlı Onun heç bir şeyini başa düşə bilməz, Onun necə görüləcəyini də qavraya bilməz. Əl, ayaq, cəhət, yer və bunlar kimi Allahu təala üçün caiz olmayan sözlərin ayəti-kərimələrdə və hədisi-şəriflərdə olması bizim başa düşdüyümüz və bildiyimiz bu gün istifadə edilən mənalarda deyildir. Belə ayəti-kərimələrə və hədisi-şəriflərə **"Mütəşabihat"** deyilir. Bunlara inanmalı, nə və necə olduqlarını anlamağa cəhd edilməməlidir. Yaxud, bunlar qısaca və ya geniş olaraq, **"Təvil"** olunur. Yəni, Allahu təalaya layiq başqa məna verilir. Məsələn, əl sözü qüdrət və enerji deməkdir.

Muhamməd əleyhissəlam Allahu təalanı Meracda gördü. Bu görmək dünyadakı baş gözü ilə görmək kimi deyildi. Bir insan Allahu təalanı dünyada gördüm desə, o zındıqdır. Övliyanın (qaddəsallahu təala əsrarəhum əcməin) görməsi, dünya və axirət görmələri kimi deyildir. Yəni **"Ruyət"** deyildir. Onlarda **"Şühud"** əmələ gəlir. [Yəni, qəlb gözü ilə timsalını görürlər]. Övliyayı-kiramdan, gördüm deyənlər oldusa da, səkr halında ikən, yəni ağılları başlarında deyilkən, şühudu ruyət zənn ediblər. Yaxud, təvil edərək anlaşılan sözlərdən biridir.

**Sual:** Allahu təalanın dünyada baş gözü ilə görülməsinin caiz olduğu yuxarda bildirilmişdi. Caiz olan bir şeyin hasil olduğunu deyən bir şəxs nə üçün zındıq olsun? Gördüm deyən kafir olursa, o şeyə caiz demək olarmı?

**Cavab:** Lüğətdə caiz kəlməsi, bir şeyin olması da, olmaması da uyğundur deməkdir. Ancaq, Əşari[1] məzhəbində ruyətin caiz ol-

[1] Əbülhəsən Əli ibn İsmayıl Əşari hicri 330-cu (m. 941) ildə Bağdadda vəfat etmişdir.

ması, Allahu təala bu dünyada yaxın olmaqdan, qarşısında olmaqdan və dünyada yaratmış olduğu fizika qanunları ilə görməkdən savayı, insanda tamamilə başqa bir görmə gücü yaratmağa qadirdir, deməkdir. Məsələn, Çində olan kor bir insana Kordovadakı ağcaqanadı göstərməyə və ya dünyadakı insana ayda və ulduzda olan şeyləri göstərməyə qadirdir və bu caizdir. Belə güc, Allahu təalaya məxsusdur. İkincisi, dünyada gördüm demək, ayəti-kəriməyə və alimlərin söz birliyinə uyğun deyildir. Buna görə də belə bir şeyi deyən kəs **“Mülhid”** və ya **“Zındıq”**dır. Üçüncü cavab olaraq deyə bilərik ki, dünyada ruyətin caiz olması, Onu dünyada fiziki qanunlarla görmək caiz olar demək deyildir. Halbuki, Allahu təalanı gördüm deyən şəxs başqa şeyləri gördüyü kimi gördüm deyir. Bu isə caiz olmayan bir görməkdir. Bunun kimi küfrə səbəb olan sözləri deyən adama mülhid və ya zındıq deyilir. [Mövlana Xalid həzrətləri] bu cavablardan sonra “Diqqət edin!” buyurur. Bununla, ikinci cavabın daha sağlam olduğuna işarə edir. **[“Mülhid”** və **“Zındıq”**, özlərinin müsəlman olduqlarını deyirlər. **“Mülhid”** bu sözündə səmimidir. Özünün müsəlman olduğuna və doğru yolda olduğuna inanır. **“Zındıq”** isə İslam düşmənidir. İslamiyyəti daxildən yıxmaq, müsəlmanları aldatmaq üçün müsəlman görünür].

Allahu təala üçün gecə-gündüz və zaman keçməsi düşüncəsi mümkün deyildir. Allahu təalada heç bir cəhətdən, heç bir dəyişiklik olmayacağı üçün keçmişdə və gələcəkdə elədir-belədir, deyilə bilməz. Allahu təala heç bir şeyə hülul etməz. Heç bir şeylə birləşməz. [Allah həzrəti Əliyə hülul etmişdir deyən, Əshabı-kirama düşmən olan **“Nüsayri”** adındakı firqələri kafirdir]. Allahu təalanın ziddi, əksi, bənzəri, ortağı, köməkçisi və qoruyucusu yoxdur. Anası, atası, oğlu, qızı, əri və ya xanımı yoxdur. Hər zaman, hər kəs ilə hazır, hər şeyi əhatə etmiş və nazirdir. Hər kəsə şah damarından daha yaxındır. Ancaq hazır olması, əhatə etməsi, birlikdə və yaxın olması, bizim başa düşdüyümüz kimi deyildir. Onun yaxınlığı alimlərin elmi, elm adamlarının zəkası və Övliyanın (qaddəsallahu təala əsrarəhum əcməin) kəşf və şühudu ilə anlaşılmaz. Bunların əslini insan ağlı qavraya bilməz. Allahu təala zatında və sifət-

lərində birdir, heç birində dəyişiklik, başqalaşma olmur. Təfəkkəru fi aləillahi və la tətəfəkkəru fi zatillahi. Birinci cild, 46-cı məktubu oxuyun!

Allahu təalanın adları **"Təvqifi"**dir. Yəni, islamiyyətdə bildirilən adları demək caizdir, bunlardan başqasını demək caiz deyildir. [Məsələn, Allahu təalaya alim deyilir. Ancaq, alim mənasında olan fəqih deyilməməlidir. Çünki, islamiyyət Allahu təalaya fəqih deməmişdir. Bunun kimi Allah adı yerinə tanrı demək caiz deyildir. Çünki tanrı, ilah, məbud deməkdir. Məsələn, hindlilərin tanrıları inəkdir, demək olar. "Birdir Allah, Ondan başqa tanrı yoxdur" deyilə bilər. Başqa dillərdəki Dieu, Gott və God kəlimələri də, ilah, məbud mənasında deyilə bilər. Allah adı yerinə istifadə etmək olmaz].

Allahu təalanın adları sonsuzdur. Min bir adı var deyə məşhurdur. Yəni, adlarından min bir dənəsini insanlara bildirmişdir. Muhamməd əleyhissəlamın dinində bunlardan doxsan doqquzu bildirilmişdir. Bunlara **"Əsmai-hüsna"** deyilir.

Allahu təalanın **"Sifəti-zatiyyə"**si altıdır. [Bunları yuxarıda bildirmişdik]. **"Sifəti-sübutiyyə"**si, **"Maturidiyyə"** məzhəbində səkkizdir. **"Əşariyyə"** məzhəbində isə yeddidir. Bu sifətləri də zatı kimi əzəlidir, əbədidir. Yəni sonsuz olaraq vardırlar, müqəddəsdirlər, məxluqların sifətləri kimi deyildirlər. Ağılla, zənn ilə və dünyadakılara bənzədilərək anlaşılmaz. Allahu təala bu sifətlərindən hər biri üçün bir nümunə insanlara ehsan buyurmuşdur. Bunları görərək Allahu təalanın sifətlərini bir az anlamaq mümkün olar. İnsan Allahu təalanı anlaya bilməyəcəyi üçün, Allahu təalanı düşünmək, anlamağa cəhd etmək caiz deyildir. Allahu təalanın səkkiz sifəti-sübutiyyəsi zatının eyni də deyildir, qeyri də deyildir. Yəni sifətləri özü deyildir, Özündən başqa da deyildir. Bu səkkiz sifət: **Həyat, elm, səm, basar, qüdrət, kəlam, iradə və təkvin'**dir.

Əşariyyə məzhəbində təkvin sifəti qüdrət sifəti ilə birdir. Məşiyyət də iradə deməkdir.

Allahu təalanın səkkiz sifətindən hər biri bəsitdir, bir haldadır. Heç birində heç bir dəyişiklik olmaz. Ancaq, məxluqlara əlaqəli olaraq hər biri çoxdur. Bir sifətin məxluqlarla əlaqə və təsiri cəhət-

dən çox olması, onun bəsit olmasına zərər vermir. Həmçinin, Allahu təala, bu qədər müxtəlif məxluqlar yaratdı və hamısını hər an yox olmaqdan qorumaqdadır. Ancaq O, yenə birdir, Onda dəyişiklik olmur. Hər məxluq, hər an, hər cəhətdən Ona möhtacdır. O, heç kimə möhtac deyildir.

2 - İman edilməsi, inanılması lazım olan altı şeydən ikincisi: **"Onun mələklərinə inanmaqdır"**. Mələk elçi, xəbər gətirən və ya güc deməkdir. Mələklər cisimdir, lətifdir. Qaz halından da daha lətifdirlər. Nuranidirlər, diridirlər, ağıllıdırlar. İnsanlardakı pisliklər mələklərdə yoxdur. Hər şəklə girə bilirlər. Qazlar maye və qatı olduğu kimi və qatı olduqda müəyyən formaya girdikləri kimi, mələklər də gözəl formalara girə bilirlər. Mələklər məşhur insanların bədənindən ayrılan ruhlar deyildirlər. Xristianlar mələkləri belə ruhlardan zənn edirlər. Enerji, güc kimi, maddəsiz də deyildirlər. Qədim filosoflardan bir hissəsi belə zənn edirdilər. Hamısına **"Məlaikə"** deyilir. Mələklər bütün canlılardan əvvəl yaradıldı. Onun üçün kitablara imandan əvvəl, mələklərə iman etmək bildirildi. Kitablar da Peyğəmbərlərdən əvvəldir. Qurani-kərimdə də inanılacaq şeylərin adı bu sıra ilə bildirilməkdədir.

Mələklərə iman belə olmalıdır: Mələklər, Allahu təalanın qullarıdır, ortaqları, qızları deyildir. Kafirlər, müşriklər elə zənn edirlər. Allahu təala mələklərin hamısını sevir. Onlar Allahu təalanın əmrlərinə itaət edirlər. Günah iş görməzlər, əmrlərə üsyan etməzlər. Erkək və dişi deyildirlər, evlənməzlər, uşaqları olmaz, həyatdadırlar, diridirlər. Abdullah ibn Məsuddan (radıyallahu anh) gələn xəbərdə, mələklərdən bir hissəsinin uşaqları olduğu, İblis və cin bunlardan olduğu bildirilməkdədirsə də, bunun cavabı kitablarda geniş yazılmışdır. Allahu təala insanları yaradacağını buyurduğu zaman, mələklərin "Ya Rəbb! Yer üzünü bərbad edəcək və qan tökəcək məxluqları yaradacaqsan?" kimi **"Zəllə"** adlanan sualları, onların məsum, günahsız olmalarına zərər vermir.

Sayı ən çox olan məxluq mələklərdir. Bunların sayılarını Allahu təaladan başqa heç kim bilməz. Göylərdə mələklərin ibadət etmədikləri boş bir yer yoxdur. Göylərin hər yeri rükuda və ya səcdə-

də olan mələklərlə doludur. Göylərdə, yerlərdə, otlarda, ulduzlarda, canlılarda, cansızlarda, yağış damcılarında, ağacların yarpaqlarında, hər molekulda, hər atomda, hər reaksiyada, hər hərəkətdə, hər şeydə mələklərin vəzifələri vardır. Hər yerdə Allahu təalanın əmrlərini yerinə yetirirlər. Allahu təala ilə məxluqları arasında vasitədirlər. Bəziləri digər mələklərin əmiridir. Bəziləri Peyğəmbərlərə xəbər gətirir. Bəziləri insanların qəlbinə yaxşı fikir gətirir ki, buna **"İlham"** deyilir. Bəzilərinin insanlardan və bütün məxluqlardan xəbəri yoxdur. Allahu təalanın camalı qarşısında huşlarını itiriblər. Hər birinin müəyyən yeri vardır, oradan ayrıla bilməzlər. Bəzisinin iki, bəzisinin dörd və ya daha çox qanadı vardır. [Hər heyvanın qanadı və təyyarələrin qanadları özlərinin quruluşunda olub, bir-birinə bənzəmədiyi kimi, mələklərin qanadı da öz cinslərindəndir. İnsan görmədiyi, bilmədiyi bir şeyin adını eşitdikdə, bunu bildiyi şeylər kimi zənn edərək aldanır. Mələklərin qanadları vardır. Buna inanırıq, ancaq necə olduğunu bilmirik. Kilsələrdə, bəzi məcmua və kinolarda mələk deyə təsvir edilən qanadlı qadın rəsmləri uydurmadır, müsəlmanlar belə rəsm çəkməz. Müsəlman olmayanların çəkdiyi bu pozğun rəsmləri doğru sanmamalı, düşmənlərə aldanmamalıyıq]. Cənnət mələkləri Cənnətdədir. Onların böyüklərinin adı **"Rizvan"**dır. Cəhənnəm mələklərinə **"Zəbani"** deyilir. Onlar Cəhənnəmdə əmr olunan vəzifələrini yerinə yetirir. Cəhənnəm alovu onlara zərər verməz. Dənizin balığa zərərli olmaması kimidir. Cəhənnəm zəbanilərinin böyüklərinin sayı on doqquzdur. Ən böyüyünün adı **"Malik"**dir.

Hər insanın xeyir və şər bütün işlərini yazan, ikisi gecə, ikisi gündüz gələn dörd mələyə, **"Kiramən katibin"** və ya **"Hafaza mələkləri"** deyilir. Hafaza mələklərinin bunlardan başqa olduğu da bildirilmişdir. Sağ tərəfdəki mələk soldakının əmiridir və yaxşı işləri, ibadətləri yazır. Soldakı isə pis əməlləri yazır. Qəbrlərdə kafirlərə və asi müsəlmanlara əzab edən mələklər və qəbrdə sual verən mələklər vardır. Sual mələklərinə **"Münkər və Nəkir"** deyilir. Möminlərdən soruşanlara **"Mübəşşir və Bəşir"** də deyilir.

Mələklərin bir-birindən üstünlükləri vardır, ən üstünlərinin sayı dörddür. Bunların birincisi **"Cəbrayıl"** əleyhissəlamdır. Onun vəzifəsi Peyğəmbərlərə **"Vəhy"** gətirmək, əmr və qadağaları bildirməkdir. İkincisi **"Sur"** adlanan borunu üfürəcək olan **"İsrafil"** əleyhissəlamdır. Suru iki dəfə üfürəcəkdir. Birincisində, Allahu təaladan başqa hər diri öləcək. İkincisində hamısı təzədən diriləcəkdir. Üçüncüsü, **"Mikayıl"** əleyhissəlamdır. Ucuzluq, bahalılıq, qıtlıq, bolluq, [İqtisadi nizam] gətirmək, [fərahlıq və hüzur gətirmək] və hər maddəni hərəkət etdirmək bunun vəzifəsidir. Dördüncüsü, **"Əzrayıl"** əleyhissəlamdır. İnsanların ruhunu alan odur. [Fars dilində ruha can deyilir.] Bu dörd mələkdən sonra üstün olan mələklər dörd sinifdir: **"Hamələyi Ərş"** adlanan mələklərin sayı dörddür, Qiyamətdə səkkiz olacaqlar. Hüzuri ilahidə olan mələklərə **"Müqarrəbin",** əzab mələklərinin böyüklərinə **"Kərubiyan",** rəhmət mələklərinə **"Ruhaniyan"** deyilir. Bunların hamısı mələklərin havası, yəni üstünləridir. Onlar Peyğəmbərlərdən başqa (əleyhimussaləvatu vəttəslimat) bütün insanlardan daha üstündür. Müsəlmanların salehləri və vəliləri mələklərin avamından, yəni aşağılarından daha fəzilətli, daha üstündür. Mələklərin avamı müsəlmanların avamından, yəni asi və fasiqlərdən daha üstündür.

Kafirlər isə hər məxluqdan daha alçaqdır. Surun birinci üfürülməsində dörd böyük mələkdən və hamələyi-Ərşdən başqa bütün mələklər də yox olacaqlar. Bundan sonra, hamələyi-Ərş və daha sonra dörd mələk yox olacaq. İkincisində əvvəlcə bütün mələklər diriləcəklər. Hamələyi-Ərş ilə bu dörd mələk surun ikinci üfürülməsindən əvvəl diriləcək. Deməli, bu mələklər bütün canlılardan əvvəl yaradıldıqları kimi, hər bir canlıdan da sonra yox olacaqlar.

3 - İman edilməsi lazım olan altı şeydən üçüncüsü: **"Allahu təalanın endirdiyi kitablarına inanmaqdır"**. Allahu təala bu kitabları mələklə bəzi Peyğəmbərlərin mübarək qulaqlarına söyləyərək, bəzilərinə isə lövhə üzərində yazılı olaraq, bəzilərinə də mələksiz eşitdirərək endirdi. Bu kitabların hamısı Allahu təalanın kəlamıdır, əbədi və əzəlidir, məxluq deyildir. Bunlar, mələklərin və ya Peyğəmbərlərin öz sözləri deyildir. Allahu təalanın kəlamı

bizim yazdığımız, yaddaşımızda saxladığımız və danışdığımız söz kimi deyildir. Yazıda, sözdə və yaddaşda olmaq kimi deyil, hərfli və səsli deyildir. Allahu təalanın və sifətlərinin necə olduğunu insan anlaya bilməz. Ancaq, o kəlamı insanlar oxuyar. Yaddaşlarda saxlanar və yazılar. Bizimlə bərabər olduqda hədis olar. Allahu təalanın kəlamı insanlarla bərabər olduqda məxluq və hədisdir. Allahu təalanın kəlamı olduğu düşünüldükdə qədimdir.

Allahu təalanın endirdiyi kitabların hamısı haqdır və doğrudur. Yalan və səhv ola bilməz. Cəza, əzab edəcəm deyib bağışlaması caizdir deyilibsə də, bizim bilmədiyimiz şərtlərə və ya Onun iradəsinə, istəyinə bağlıdır. Yaxud, qulun layiq olduğu əzabı əfv edər deməkdir. Cəzanı, əzabı bildirən söz, bir şeyi xəbər vermək deyildir ki, bağışladıqda yalançılıq sayılsın. Allahu təalanın vəd etdiyi nemətləri verməməsi caiz deyilsə də, əzabları bağışlaması caizdir. Ağıl da, ayəti-kərimələr də belə olduğunu göstərir.

Bir maneə, müşkül olmadıqca, ayəti-kərimələrə və hədisi-şəriflərə açıq şəkildə anlaşılan mənaları vermək lazımdır. Bunlara bənzəyən başqa məna vermək caiz deyildir. [Qurani-kərim və hədisi-şəriflər Qureyş lüğəti və ləhcəsinə görədir. Kəlimələrə 1400 il əvvəl Hicazda istifadə edilən mənaları vermək lazımdır. Zaman keçdikcə dəyişib, bu gün istifadə edilən mənaları verərək tərcümə etmək doğru deyildir]. **“Mütəşabihat”** adlanan ayəti-kərimələrdə anlaşılmayan gizli mənalar vardır. Bunların mənasını ancaq Allahu təala bilir və adları **“Elmi lədunni”** verilmiş çox az seçilmiş böyüklər onlara bildirildiyi qədər anlaya bilərlər. Başqa heç kim anlaya bilməz. Ona görə, mütəşabih ayələrin Allah kəlamı olduğuna iman edilməli, mənaları araşdırılmamalıdır. Əşari məzhəbindəki alimlər belə ayələri, qısaca və ya geniş olaraq “Təvil” etmək caiz olar demişlər. Təvil - kəlimənin müxtəlif mənaları arasından məşhur olmayanı seçmək deməkdir. Məsələn, Fəth surəsində, **“Allahın əli onların əllərinin üstündədir”** məalındakı ayəti-kərimə Allahu təalanın kəlamıdır. Allahu təala bununla nəyi murad edirsə, o şəkildə inandım deyilməlidir. Bunun mənasını mən başa düşə bilmərəm, ancaq Allahu təala bilər demək ən yaxşı yoldur. Yaxud,

Allahu təalanın elmi bizim elmimiz kimi deyildir. İradəsi bizim iradəmizə bənzəməz. Allahu təalanın əli də qulların əlləri kimi deyildir.

Allahu təalanın endirdiyi kitablarda bəzi ayələrin yalnız oxunuşu, yaxud yalnız mənası və ya ikisi birdən ləğv edilmiş, Allahu təala tərəfindən dəyişdirilmişdir. Qurani-kərim bütün kitabları ləğv etmiş, hökmlərini ortadan qaldırmışdır. Qurani-kərimdə qiyamətə qədər heç bir zaman səhv, unudulmaq, artıqlıq və nöqsanlıq olmaz. Keçmişdəki və gələcəkdəki bütün elmlər Qurani-kərimdə vardır. Bunun üçün bütün səmavi kitablardan üstün və qiymətlidir. Rəsulullahın (sallallahu əleyhi və səlləm) ən böyük möcüzəsi Qurani-kərimdir. Bütün insanlar və cinlər bir yerə yığılsa, hamısı Qurani-kərimin ən qısa bir surəsi kimi bir söz deyə bilmək üçün çalışsalar, yenə də deyə bilməzlər. Ərəbistanın bəlağətli, ədib, fəsahətli şairləri bir yerə toplanıb, çox çalışdılarsa da, bir qısa ayə kimi bir söz deyə, Qurani-kərimə zidd çıxa bilmədilər. Heyrətlərindən donub qaldılar. Allahu təala islam düşmənlərini Qurani-kərim qarşısında aciz və məğlub edir. Qurani-kərimin bəlağəti insan gücündən yüksəkdədir. İnsanlar ona bənzər söz söyləməkdə acizdirlər. Qurani-kərimin ayələri insanların nəzminə, vəznli olmayan nəsrinə, qafiyəli sözlərinə bənzəmir. Amma buna baxmayaraq Qurani-kərim Ərəbistandakı ədiblərin istifadə etdiyi hərflərlə söylənmişdir.

Səmavi kitablardan bizə yüz dörd ədədi bildirildi. Bunlardan on sühüf **Adəm** əleyhissəlama, əlli sühüf **Şis (Şit)** əleyhissəlama, otuz sühüf **İdris** əleyhissəlama, on sühüf **İbrahim** əleyhissəlama endirildiyi məşhurdur. **Tövrat** kitabı Musa əleyhissəlama, **Zəbur** kitabı Davud əleyhissəlama, **İncil** kitabı İsa əleyhissəlama və **Qurani-kərim** Muhamməd əleyhissəlama endirilmişdir.

Bir insan əmr etmək, qadağan etmək və ya bir şey soruşmaq, bir xəbər vermək istəsə, əvvəlcə bunları fikirləşər və zehnində hazırlayar. Zehnində olan bu mənalara "**Kəlamı-nəfsi**" deyilir. Bu mənalara ərəbcə, farsca və ya türkcə deyilməz. Müxtəlif dillərdə deyilməsi, bunların ayrı-ayrı məna ifadə edilmələrinə səbəb olmaz. Bu mənaları ifadə edən sözlərə "**Kəlamı-lafzı**" deyilir. Kəlamı-laf-

zı müxtəlif dillərlə izah edilə bilər. Buradan məlum olur ki, kəlamı-nəfsi başqa sifətlər kimi, məsələn, elm, iradə, görmək... kimi kəlam sahibində olan bəsit, dəyişməz və ayrı bir sifətdir. Kəlamı-lafzı isə, kəlamı-nəfsini ifadə edən, insanın eşitdiyi və söyləyənin ağzından çıxan hərflərin cəmidir. Beləliklə də, Allahu təalanın kəlamı heç susmayan, məxluq olmayan və zatı ilə olan, əzəli və əbədi bir kəlamdır. Sifəti-zatiyyəsindən və elm, iradə kimi sifəti-sübutiyyələrindən ayrı, tamamilə başqa bir sifətdir.

Kəlam sifəti də bəsitdir, əsla dəyişməz, hərfli və səsli deyildir. Əmr, qadağa, xəbər vermək kimi və ərəbcə, farsca, ibranicə, türkcə və süryanicə kimi başqalaşması və parçalanması yoxdur. Belə şəkil almaz, yazılmaz. Zehin, qulaq və dil kimi üzvlərə və vasitələrə möhtac deyildir. Hər bir dildə söyləmək olar. Beləcə, ərəbcə söylənirsə, Qurani-kərim deyilir. İbranicə söylənirsə, Tövratdır. Süryanicə olduqda İncildir. [**“Şərhul-məqasid”**[1] kitabında yunanca olsa İncil, süryanicə olduqda Zəburdur deyilir].

Kəlamı-ilahi müxtəlif şeyləri bildirir. Qissələri, yəni hadisələri bildirirsə **“Xəbər”** olur, belə olmazsa, **“İnşa”** olur. Əməl olunması lazım olan şeyləri bildirərsə, **“Əmr”,** qadağaları bildirərsə, **“Nəhy”** olur. Ancaq kəlami-ilahidə qətiyyən dəyişiklik və çoxalma olmaz. Endirilən kitabların və səhifələrin hamısı Allahu təalanın kəlam sifətindəndir. Kəlam sifətindən, yəni kəlamı-nəfsidəndir. Ərəbcə olduqda Qurani-kərimdir. Hərfli olub, yazılan, deyilən, eşidilən və yaddaşda əzbərlənən nəzm halında endirilən vəhyə **“Kəlamı-lafzı”** və **“Qurani-kərim”** deyilir. Bu kəlami-lafzı, kəlamı-nəfsini göstərdiyi üçün buna da kəlamı-ilahi və sifəti-ilahi demək caizdir. Hamısına Qurani-kərim deyildiyi kimi, hissələrinə də Quran deyilir.

Kəlamı-nəfsinin məxluq olmadığını və qədim olduğunu, doğru yolun alimləri yekdilliklə söyləməkdədirlər. Kəlamı-lafzının hədis və ya qədim olmasında bu yekdillik yoxdur. Hədis olduğunu bildirənlərdən bəziləri kəlamı-lafzının hədis olduğunun deyilməməsini lazım bilmişlər. Əgər, hədis deyilərsə, kəlamı-nəfsinin

[1] Şərhul-Məqasidi Saduddin Taftazani yazmışdır. O, 792-ci (m. 1389) ildə Səmərqənddə vəfat etmişdir.

hədis olduğu anlaşıla bilər, buyurdular. Ən yaxşı söz də budur. İnsanların yaddaşı bir şeyi göstərəni eşitdikdə, dərhal o şeyi xatırlayır. Əhli-sünnət alimlərindən, Qurani-kərim hədisdir deyənlərin bu sözü ağzımızla oxuduğumuz, səs və sözlərin məxluq olduğunu bildirmişdir. Əhli-sünnət alimləri yekdilliklə, kəlamı-lafzının da, nəfsinin də Allah kəlamı olduğunu söylədilər. Bu sözdə məcaz yoluna gedənlər olsa da, kəlamı-nəfsi Allah kəlamıdır demək, Allahu təalanın kəlam sifətidir deməkdir. Kəlamı-lafzı Allah kəlamıdır demək, Allahu təala onun xaliqidir, deməkdir.

**Sual:** Yuxarıdakı yazılardan aydın olur ki, Allahu təalanın əzəli olan kəlamı eşidilməz. Allah kəlamını eşitdim demək, oxunan səs və sözləri eşitdim, deməkdir. Yaxud, oxunan səs və əzəli olan kəlamı-nəfsini başa düşdüm, deməkdir. Bütün Peyğəmbərlər, hətta hər kəs bu iki şəkildə də eşidə bilirlər. Musa əleyhissəlamı, "kəlimullah" olaraq ayırmağın səbəbi nədir?

**Cavab:** Musa əleyhissəlam adəti-ilahiyyənin xaricində hərfsiz və səssiz olan kəlamı-əzəlini eşitdi. Cənnətdə anlaşıla bilinməyən və izah olunmaz bir şəkildə Allahu təala görüləcəyi kimi, Onu izah olunmaz bir şəkildə eşitdi. Başqa heç kim belə eşitmədi. Yaxud, Allahın kəlamını səslə eşitdi, lakin, yalnız qulaqla deyil. Vücudunun hər zərrəsi, hər tərəfdən eşitdi. Yaxud, yalnız ağac tərəfindən eşitdi, ancaq, səs ilə deyildi. Hava titrəməsi və ya başqa hadisələrlə eşitmədi. Bu üç haldan biri ilə eşitdiyi üçün **"Kəlimullah"** adına qovuşdu. Muhamməd əleyhissalatu vəssəlamın Merac gecəsində kəlamı-ilahini eşitməsi və Cəbrayıl əleyhissəlamın vəhy alarkən eşitməsi də belə idi.

4 - İman edilməsi, inanılması lazım olan altı şeydən dördüncüsü, **"Allahu təalanın Peyğəmbərlərinə inanmaqdır"**. Peyğəmbərlər insanları Allahu təalanın bəyəndiyi yola qovuşdurmaq, doğru yolu göstərmək üçün göndərilmişlər. Rüsul, rəsullar deməkdir. Lüğətdə göndərilmiş şəxs və xəbərçi deməkdir. İslamiyyətdə **"Rəsul" -** yaradılışı, xasiyyəti, elmi və ağlı öz dövründə olan bütün insanlardan üstün, qiymətli və möhtərəm bir şəxs deməkdir. Heç bir pis xasiyyəti, bəyənilməyən bir halı yoxdur. Peyğəmbərlərdə

**“İsmət”** sifəti vardır. Yəni, Peyğəmbər olduğu bildirilmədən əvvəl və bildirildikdən sonra kiçik və böyük heç bir günah iş görməz. [İslamiyyəti daxildən yıxmaq istəyən kafirlər Muhamməd əleyhissəlam Peyğəmbər olmamışdan əvvəl heykəllərin qabağında qurban kəsərdi, deyirlər və məzhəbsizlərin kitablarını da sübut olaraq göstərirlər. Bu çirkin iftiralarının yalan olduğu yuxarıdakı sətirlərdən aydın olur]. Peyğəmbər olduğu bildirildikdən sonra, Peyğəmbər olduğu yayılana və anlaşılana qədər korluq, karlıq və buna oxşar eyib və qüsurları da olmaz. Hər Peyğəmbərdə yeddi sifətin olduğuna inanmaq lazımdır: Əmanət, sidq, təbliğ, ədalət, ismət, fətanət və əmnul-əzl. Yəni Peyğəmbərlikdən əzl edilməzlər. Fətanət çox ağıllı və çox anlayışlı deməkdir.

Yeni bir din gətirən Peyğəmbərə **“Rəsul”** deyilir. Yeni din gətirməyib, insanları əvvəlki dinə dəvət edən Peyğəmbərə **“Nəbi”** deyilir. Əmrləri təbliğ etməkdə və insanları Allahu təalanın dininə çağırmaqda Rəsul ilə Nəbi arasında bir fərq yoxdur. Peyğəmbərlərə iman etmək, aralarında heç bir fərq görməyərək, hamısının sadiq və doğru sözlü olduğuna inanmaqdır. Onlardan birinə inanmayan heç birinə inanmamış sayılır.

Peyğəmbərlik - çalışmaqla, aclıq, çətinlik çəkməklə və çox ibadət etməklə ələ keçməz. Yalnız və yalnız Allahu təalanın ehsanı və seçməyi ilə mümkündür. İnsanların dünyadakı və axirətdəki işlərinin düzgün və faydalı olması üçün zərərli işlərdən qoruyub, səlamətə, hidayətə və rahatlığa qovuşdurmaq üçün Peyğəmbərlər vasitəsi ilə dinlər göndərilmişdir. Düşmənləri çox olsa da, Onları ələ salıb incitsələr də, Allahu təalanın inanmaq və əməl etmək üçün olan əmrlərini insanlara təbliğ etməkdə, bildirməkdə düşmənlərdən qorxmayaraq gözlərini qırpmadan öz vəzifələrini yerinə yetirmişlər. Allahu təala Peyğəmbərlərin sidq sahibi olduqlarını, doğru söylədiklərini göstərmək üçün Onları möcüzələrlə gücləndirdi. Heç kim bu möcüzələrin qarşısında dura bilmədi. Peyğəmbəri qəbul edib inanan hər kəsə o Peyğəmbərin **“Ümməti”** deyilir. Qiyamət günündə ümmətlərindən günahı çox olanlara şəfaət etmələri üçün icazə veriləcək və şəfaətləri qəbul olacaqdır. Ümmətlərindən

alim, saleh və Vəli olanlarına da şəfaət etmələri üçün Allahu təala icazə verəcək və şəfaətlərini qəbul edəcəkdir. Peyğəmbərlər (əleyhimussaləvatu vəttəslimat) qəbirlərində bizim bilmədiyimiz bir həyatla diridirlər. Mübarək bədənlərini torpaq çürütməz. Bunun üçündür ki, hədisi-şərifdə, **“Peyğəmbərlər qəbirlərində namaz qılar və həcc edərlər”** buyurulmuşdur.

[Hal-hazırda bəzi ölkələrdə olan **“Vəhhabi”** adlandırılan insanlar bu hədisi-şəriflərə inanmırlar. Bunlara inanan həqiqi müsəlmanlara kafir deyirlər. Mənaları açıq olmayan, şübhəli olan nassları səhv təvil etdikləri üçün onlar kafir olmursa da, **“Bidət sahibi”** olurlar. Müsəlmanlara çox zərər verirlər. Vəhhabilik Muhamməd ibn Abdülvəhhab adlı Nəcdli bir bədəvi tərəfindən quruldu. İngilis cəsusu Hempher, İbn Teymiyyənin[1] səhv fikrlərini ortaya ataraq onu aldatdı. Abduh[2] adlı bir misirlinin kitabları ilə hər yerə yayıldı. Bunların beşinci məzhəb deyil, dəlalətdə və səhv yolda olduqlarını, **“Əhli-sünnət”** alimləri qələmə aldıqları yüzlərlə kitablarında qeyd etmişlər. **“Səadəti əbədiyyə”** və “**Qiyamət və Axirət**” kitablarında bunlar geniş yazılmışdır. Allahu təala gənc din adamlarını ingilislərin çıxartdığı vəhhabilik yoluna düşməkdən mühafizə etsin. Hədisi-şəriflər ilə mədh olunan **“Əhli-sünnət”** alimlərinin yolundan ayırmasın!]

Peyğəmbərlərin (aleyhimüssəlam) mübarək gözləri yatarkən qəlb gözləri yatmaz. Peyğəmbərlik vəzifələrini görməkdə, Peyğəmbərlik üstünlüklərinə sahib olmaqda bütün Peyğəmbərlər eynidir. Yuxarıda qeyd etdiyimiz yeddi şey hamısında vardır. Peyğəmbərlər Peyğəmbərlikdən əzl edilməz və vəzifələrindən uzaqlaşdırılmazlar. Vəlilərdən isə övliyalıq alına bilər. Peyğəmbərlər (əleyhimussaləvatu vəttəslimat) insandan olur. Cindən, mələkdən insanlara Peyğəmbər gəlməmişdir. Cin və mələk Peyğəmbərlərin dərəcələrinə yüksələ bilməz. Peyğəmbərlərin bir-birlərinə görə şərəfləri və üstünlükləri vardır. Məsələn, ümmətlərinin çox olması, göndərildikləri ölkələrin böyük olması, elm və mərifətlə-

---

[1] Əhməd İbn Teymiyyə 728-ci (m. 1328) ildə Şamda vəfat etmişdir.
[2] Məhəmməd Abduh, 1323-cü (m. 1905) ildə Misirdə vəfat etmişdir.

rinin çox yerlərə yayılması, möcüzələrinin daha çox və davamlı olması, onlara verilən ayrı dəyər və ehsanların olması kimi üstünlüklər baxımından axır zaman Peyğəmbəri **"Muhamməd"** əleyhissəlam bütün Peyğəmbərlərdən daha üstündür. Ülül-əzm olan Peyğəmbərlər digər Peyğəmbərlərdən və Rəsullar rəsul olmayan Nəbilərdən daha üstündürlər. Peyğəmbərlərin (əleyhimussaləvatu vəttəslimat) sayı dəqiq bilinmir. 124000-dən çox olduqları məşhurdur. Bunlardan 313 və ya 315-i Rəsuldur. Bunların içərisindən də altısı daha yüksəkdir. Bunlara **"Ülül-əzm"** Peyğəmbərlər deyilir. Ülül-əzm Peyğəmbərlər – Adəm, Nuh, İbrahim, Musa, İsa və Muhamməd Mustafadır (əleyhimussalatu vəssəlam).

Peyğəmbərlərin içərisində 33-ü məşhurdur. Bunlar: **Adəm, İdris, Şit və ya Şis, Nuh, Hud, Saleh, İbrahim, Lut, İsmayıl, İshaq, Yaqub, Yusif, Eyyub, Şuayb, Musa, Harun, Xızır, Yuşa ibn Nun, İlyas, Əlyəsa, Zülkifl, Şəmun, İşmoil, Yunis ibn Məta, Davud, Süleyman, Loğman, Zəkəriyyə, Yəhya, Üzeyir, İsa ibn Məryəm, Zülqərneyn** və **Muhamməd** əleyhi və əleyhimussalatu vəssəlamdır.

Bunlardan ancaq 28-nin adları Qurani-kərimdə bildirilmişdir. Şit, Xızır, Yuşa, Şəmun və İşmoil bildirilməmişdir. Bu iyirmi səkkizindən Zülqərneyn, Loğman, Üzeyir və Xızırın Peyğəmbər olub olmadıqları dəqiq məlum deyildir. **"Məktubati-Məsumiyyə"** 2-ci cild, 36-cı məktubda Xızır əleyhissəlamın Peyğəmbər olduğunu bildirən xəbərlərin qüvvətli olduğu yazılmışdır. 182-ci məktubda Xızır əleyhissəlamın insan şəklində görünməsi və bəzi işləri görməsi Onun həyatda olduğunu göstərməz. Allahu təala Onun və bir çox Peyğəmbərlərin, vəlilərin ruhlarının insan şəklində görülməsinə icazə vermişdir. Onları görmək həyatda olduqlarını göstərməz, deyilir. Zülkifl əleyhissəlamın ikinci adı Harqıldır. Bunun İlyas və ya İdris yaxud Zəkəriyya əleyhissəlam olduğunu deyənlər də vardır.

İbrahim əleyhissəlam Xəlilullahdır. Çünki, onun qəlbində Allahu təalanın sevgisindən başqa heç bir məxluqun sevgisi yoxdu. Musa əleyhissəlam Kəlimullahdır. Çünki, Allahu təala ilə danışdı. İsa əleyhissəlam Kəlimətullahdır, çünki atası yoxdur. Yalnız **"OL"**

kəlmeyi-ilahiyyəsi ilə anasından dünyaya gəldi. Bundan başqa Allahu təalanın hikmət dolu kəlamlarını nəsihət edərək insanlara çatdırardı. Adəm oğullarının ən üstünü, ən şərəflisi, ən qiymətlisi və məxluqların yaradılmasına səbəb olan Muhamməd əleyhissəlam Həbibullahdır. Onun Həbibullah olduğunu və böyüklüyünü, üstünlüyünü göstərən əlamətlər həddən artıq çoxdur. Bunun üçün Ona məğlub oldu və uduzdu kimi sözlər demək olmaz. Qiyamətdə hər kəsdən əvvəl qəbrdən qalxacaq, məhşər yerinə hər kəsdən əvvəl gedəcəkdir. Cənnətə hər kəsdən əvvəl girəcəkdir. Möcüzələri sayılmaqla bitməz və saymağa insan gücü çatmasa da, Merac möcüzəsini yazmaqla yazılarımızı daha da qiymətləndirək: Rəsulullah (sallallahu təala əleyhi və səlləm) yatağında ikən oyadılıb, mübarək bədəni ilə Məkkə şəhərindən Qüdsdəki Məscidi-Əqsaya, oradan göylərə və yeddinci göydən sonra Allahu təalanın dilədiyi yerlərə aparıldı. Meraca bu şəkildə inanmaq lazımdır. [Yolunu azan İsmaili firqəsindən olanlar və islam alimi şəklinə girən din düşmənləri Merac bir hal idi, yalnız ruh ilə oldu. Bədən ilə getmədi deyərək və yazaraq gəncləri aldatmağa çalışırlar. Belə yanlış kitablar alınmamalı, bunlara aldanılmamalıdır. Meracın necə olduğu bir çox qiymətli kitablarda, məsələn, **“Şifayi şərif”**də[1] geniş şəkildə yazılmış, **“Səadəti əbədiyyə”** kitabında da geniş nəql edilmişdir]. Məkkəyi mükərrəmədən **“Sidrətul-müntəha”**ya qədər Cəbrayıl əleyhissəlam ilə birlikdə getdi. **“Sidrətul-müntəha”** altıncı və yeddinci göylərdə olan elə bir ağacdır ki, bütün bilgilər və bütün yüksəlişlər oradan irəli keçə bilməz. Rəsuli-əkrəm (sallallahu əleyhi və səlləm) Sidrədə Cəbrayıl əleyhissəlamı altı yüz qanadı ilə gerçək şəklində gördü. Cəbrayıl əleyhissəlam Sidrədə qaldı. Məkkədən Qüdsi-şərifə qədər və ya yeddinci göyə qədər **“Buraq”** üstündə aparıldı. **“Buraq”** ağ rəngli, qatırdan kiçik və mərkəbdən böyük olan bir Cənnət heyvanıdır. Dünya heyvanlarından deyildir. Erkəkliyi və dişiliyi yoxdur, çox sürətli gedərdi. Gözün görə bildiyi uzaqlığa ayağını atardı. Rəsulullah (sallallahu

[1] Şifa əsərini qələmə alan Qazı İyaz Maliki 544-cü (m. 1150) ildə Mərakeşdə vəfat etmişdir.

əleyhi və səlləm), **“Məscidi Əqsa”**da Peyğəmbərlərə imam olub, işa yaxud sübh namazını qıldırdı. Peyğəmbərlərin ruhları öz insan şəklində orada idilər. **“Qüds”**dən yeddinci göyə qədər **“Merac”** adlı bilinməyən bir nərdivanla bir göz qırpımında çıxarıldı. Yolda mələklər sağ və sol tərəflərdə düzülmüş, Rəsulullahı mədh və səna edirdilər. Hər qat səmaya çatdıqda Cəbrayıl əleyhissəlam Rəsulullahın təşrif etdiyini xəbər və müjdə verirdi. Hər birində bir Peyğəmbəri görüb salamlaşırdı. **“Sidrə”**də heyrətamiz çox şeylər gördü. Cənnətdəki nemətləri, Cəhənnəmdəki əzabları gördü. Cənab Haqqın camalını görmək arzusundan və zövqündən Cənnətdəki nemətlərin heç birinə baxmadı. Sidrədən irəliyə yalnız olaraq nurlar arasında irəlilədi. Mələklərin qələmlərinin səslərini eşitdi. Yetmiş min pərdədən keçdi. İki pərdə arası beş yüz illik yol kimi idi. Bundan sonra günəşdən daha parlaq **“Rəfrəf”** adlı bir döşəyin üstündə Kürsüdən keçdi, Ərşi-ilahiyə çatdı. Ərşdən, zamandan, məkandan, maddə aləmlərindən xaricə çıxdı. Cənab Haqqın kəlamını eşidəcək məqama çatdı.

Zamansız və məkansız olaraq, axirətdə Allahu təalanın görüləcəyi kimi, anlaşılmayan və izahı mümkün olmayan bir halda Allahu təalanı gördü. Hərfsiz və səssiz olaraq Allahu təala ilə danışdı. Allahu təalanı zikr, həmd və səna etdi. Saysız ikramlara və şərəflərə qovuşdu. Özünə və ümmətinə əlli vaxt namaz fərz oldusa da, Musa əleyhissəlamın işarəsi ilə yavaş-yavaş beş vaxta endirildi. Bundan əvvəl yalnız sübhlə əsr, yaxud işa namazları qılınardı. Bu qədər uzun səfərdən və ikramlara, ehsanlara qovuşduqdan və bu qədər heyrətamiz şeylər görüb eşitdikdən sonra yatağına gəldi. Yatağı daha soyumamışdı. Bildirdiklərimizin bir hissəsi ayəti-kərimələrlə, bir hissəsi də hədisi-şəriflərlə xəbər verilmişdir. Hamısına inanmaq vacib deyilsə də Əhli-sünnət alimləri bildirdiyi üçün bu xəbərləri qəbul etməyən, Əhli-sünnətdən ayrılmış olar. Ayəti-kəriməyə və ya hədisi-şəriflərə inanmayan isə kafir olar.

Muhamməd əleyhissəlamın **“Seyyidul-ənbiya”** olduğunu, yəni Peyğəmbərlərin (əleyhimussaləvatu vəttəslimat) ən üstünü olduğunu göstərən saysız əlamətlərdən bir neçəsini qeyd edək:

Qiyamət günü bütün Peyğəmbərlər (əleyhimussaləvatu vət-təslimat) Onun bayrağı altında kölgələnəcəklər. Allahu təala hər Peyğəmbərə [Məxluqlarımın içərisində seçib sevdiyim, həbibim Muhamməd əleyhissəlamın Peyğəmbər olduğu zamana çatsanız, Ona iman edin və yardımçı olun, deyə] əmr etdi. Bütün Peyğəmbərlər də ümmətlərinə belə vəsiyyət və əmr etdilər.

Muhamməd əleyhissəlam, **"Xatəmul-ənbiya"**dır. Yəni, Ondan sonra əsla Peyğəmbər gəlməyəcəkdir. Mübarək ruhu hər Peyğəmbərdən əvvəl yaradıldı. Peyğəmbərlik məqamı ən əvvəl Ona verildi. Peyğəmbərlik Onun dünyaya təşrif etməsi ilə tamamlandı. İsa əleyhissəlam qiyamətə yaxın həzrəti Mehdi zamanında göydən Şama enəcək və yer üzünə Muhamməd əleyhissəlamın dinini yayacaq, Onun ümmətindən olacaqdır.

[Hicri qəməri 1296 və miladi 1880-ci ildə Hindistanda İngilislərin ortaya çıxartdıqları **"Qadıyani"** adlandırılan yoldan azmışlar İsa əleyhissəlama da çirkin və yalan iftiralar atırlar. Özlərinə müsəlman desələr də islamiyyəti daxildən yıxmaqla məşğuldurlar. Müsəlman olmadıqlarına fətva verilmişdir. Bunlara **"Əhmədi"** də deyilir.

Hindistanda ortaya çıxan bidət əhli və zındıqlardan biri də **"Camaatüt-təbliğıyyə"** firqəsidir. Bu firqəni 1345-cü ildə (m.1926) İlyas adlı bir cahil qurmuşdur. "Müsəlmanlar zəlalətə düşdü. Onları xilas etmək üçün yuxuda əmr aldım" deyirdi. Yolunu azmış şeyxləri, Nəzir Hüseyn, Rəşid Əhməd Kənkuhi və Xəlil Əhməd Səharənpurinin kitablarından öyrəndiklərini iddia edirdi. Müsəlmanları aldatmaq üçün daima namazın və camaatın qiymətini vurğulayardı. Halbuki, bidət əhlinin, yəni **"Əhli-sünnət"** məzhəbində olmayanların namazları və heç bir ibadətləri qəbul olmaz. Bunların Əhli-sünnət kitablarını oxuyaraq əvvəla bidət etiqadlardan xilas olub, həqiqi müsəlman olmaları lazımdır. Qurani-kərimdə üstü örtülü şəkildə bildirilmiş ayələrdən səhv məna çıxaranlara **"Bidət əhli"** və ya "**Yolunu azmışlar"** deyilir. Ayəti-kərimələrə öz xain və səhv düşüncələrinə görə yanlış məna verən islam düşmənlərinə **"Zındıq"** deyilir. Zındıqlar Qurani-kərimi və islamiyyəti dəyişdirməyə çalışırlar. Bunları ortaya çıxaran, bəsləyən və dünyanın hər

tərəfinə yaymaq üçün milyardlar sərf edən ən böyük düşmən Asiya və Afrika ölkələrinin müstəmləkəyə çevirən imperialistlərdir. Onların tələlərinə düşmüş cahil və soysuz **“Təbliği camaatçı”**lar özlərinə **“Əhli-sünnət”** deyərək və namaz qılaraq yalan danışır, müsəlmanları aldadırlar. Abdullah ibn Məsud buyurur ki, “Dini olmadığı halda namaz qılan kəslər peyda olacaqdır”. Onlar Cəhənnəmin dibində sonsuz yanacaqlar. Onlardan bəziləri minarənin başındakı leylək yuvası kimi böyük əmmamələri, saqqalları və cübbələri ilə ayəti-kərimələr oxuyub, bunlara səhv məna verərək müsəlmanları aldadırlar. Halbuki hədisi-şərifdə **“İnnallahə la yənzuru ila suvərikum və siyabikum və lakin yənzuru ila qulubikum və niyyatikum”**, “Allahu təala xarici görüşünüzə və paltarlarınıza deyil, qəlblərinizə və niyyətlərinizə baxar” buyuruldu.

Beyt:
Qəddi bülənd darəd, dəstar parə-parə,
Çün aşiyani ləklək, bər kəlləyi minarə.

Bu cahillərin, axmaqların şirin sözlərinin yalan olduqlarını isbat edən, **“Hakikat Kitabevi”**nin kitablarına cavab verə bilmədikləri üçün, “Həqiqət Kitab evinin kitabları səhvdir və yalnışdır. Bu kitabları oxumayın” deyirlər. Yollarını azmış İslam düşmənlərinin, zındıqların ən böyük əlaməti Əhli-sünnət alimlərinin yazılarına və bunları nəşr edən həqiqi din kitablarına, yanlışdır, bunları oxumayın demələridir. İslamiyyətə verdikləri zərərləri və Əhli-sünnət alimlərinin cavabları, **“Faydalı Bilgilər”** kitabımızda geniş yazılmışdır].

Muhamməd əleyhissəlam Peyğəmbərlərin ən üstünü, aləmlərin rəhmətidir. On səkkiz min aləm Onun rəhmət dəryasından faydalanır. Yekdilliklə bütün insanların və cinlərin Peyğəmbəridir. Mələklərə, bitkilərə, heyvanlara və hər maddəyə də Peyğəmbər olduğunu bildirənlər çoxdur. Digər Peyğəmbərlər müəyyən bir yerdə, müəyyən bir qövmə göndərilmişdi. Rəsuli-əkrəm (sallallahu əleyhi və səlləm) isə bütün aləmlərə, canlı və cansız hər məxluqa Peyğəmbərdir. Allahu təala başqa Peyğəmbərləri adla-

rıyla bildirmişdir. Muhamməd əleyhissəlamı isə, ey Rəsulum, ey Peyğəmbərim deyərək təltif etmişdir. Başqa Peyğəmbərlərin hər birinə verilən hər bir möcüzənin bənzəri Ona da ehsan edilmişdir. Allahu təala sevgili Peyğəmbərinə o qədər çox ikram etmişdir, o qədər çox möcüzə vermişdir ki, başqa heç bir Peyğəmbərinə bu qədər verməmişdir. Mübarək barmağı ilə işarə etdikdə, ayın iki yerə ayrılması, mübarək ovcuna götürdüyü daşların zikr etməsi, ağacların "ya Rəsulallah" deyərək Ona salam verməsi, Rəsulullah yanından ayrıldığı üçün **"Hannanə**" adlı quru odunun səsli bir şəkildə ağlaması, mübarək barmaqlarının arasından təmiz su axması, axirətdə Ona **"Məqamı-Mahmud"**, **"Şəfaəti-kübra"**, **"Kövsər hovuzu"**, **"Vəsilə"** və **"Fəzilə"** adlı məqamların verilməsi, Cənnətə girmədən əvvəl camali-ilahini görməklə şərəflənməsi ilə və dünyada xulqi əzim, dində yəqin, elm, həlim, səbir, şükür, zühd, iffət, ədalət, mürüvvət, həya, şücaət, təvazö, hikmət, ədəb, səmahət (yaxşılıq edən), mərhəmət (rəfət), saysız-hesabsız fəzilətlər və şərəflərlə bütün Peyğəmbərlərdən üstün olmuşdur. Ona verilən möcüzələrin sayını Allahu təaladan başqa heç kim bilmir. Onun dini bütün dinləri ləğv etmiş, ortadan qaldırmışdır. Dini bütün dinlərin ən yaxşısı və ən yüksəyidir. Onun ümməti bütün ümmətlərdən üstündür. Onun ümmətinin Övliyası, başqa ümmətlərin Övliyasından daha şərəflidir.

Muhamməd əleyhissəlamın ümmətinin Övliyası arasında Rəsulullahın xəlifəsi olmağa haqq qazanan və xilafətə başqalarından daha layiq olan, imamların, Vəlilərin baş tacı "Əbu Bəkir Siddiq" (radıyallahu anh), Peyğəmbərlərdən sonra gəlmiş və gələcək bütün insanların ən xeyirlisi və ən üstünüdür. Xilafət dərəcəsini və şərəfini ən əvvəl qazanan Odur. Müsəlmanlıq meydana çıxmamışdan əvvəl də Allahu təalanın lütfü və ehsanı ilə bütlərə sitayiş etmədi. Kafirlik və azğınlıq kimi qüsurlardan qorundu. [Rəsulullahın nübüvvətdən əvvəl bütlərə sitayiş etdiyini zənn edən və yazanların nə qədər yazıq və cahil olduqlarını buradan da başa düşmək mümkündür].

Bundan sonra insanların ən üstünü, Faruqi-əzəm, Allahu təalanın Həbibinə dost olaraq seçdiyi, ikinci xəlifə **"Ömər ibn**

**Xəttab"**dır (radıyallahu təala anh). Bundan sonra insanların ən üstünü Rəsulullahın üçüncü xəlifəsi, yaxşılıqlar və ehsanlar xəzinəsi, həya, iman və irfan qaynağı, Zinnureyn **"Osman ibn Əffan"**dır (radıyallahu təala anh). Bundan sonra insanların ən xeyirlisi, Rəsulullahın dördüncü xəlifəsi, heyrətamiz üstünlüklər sahibi, Allahu təalanın aslanı **"Əli ibn Əbi Talıb"**dır (radıyallahu təala anh). Bundan sonra, **"Həzrəti Həsən"** xəlifə oldu. Hədisi-şərifdə bildirilən otuz il xəlifəlik onunla tamamlandı[1]. Bundan sonra insanların ən üstünü, Rəsulullahın (sallallahu təala əleyhi və səlləm), iki gözünün nuru **"Hüseyn ibn Əli"**dir (radıyallahu təala anhum).

Bu üstünlüklər, savabın daha çox olması, dini-islam uğrunda vətənlərini və sevdiklərini tərk etmək, başqalarından daha əvvəl müsəlman olmaq, Rəsulullaha (sallallahu təala əleyhi və səlləm) tam tabe olmaq, Onun sünnətinə sarılmaq, dinini yaymağa çalışmaq, küfrün, fitnə və fəsadın qarşısını almaq deməkdir.

Əli (radıyallahu anh) hər nə qədər Əbu Bəkrdən (radıyallahu anh) başqa, hər kəsdən əvvəl müsəlman oldusa da, o zaman uşaq olduğu, mal-mülksüz olduğu, Rəsulullahın evində və xidmətində olduğu üçün onun birinci iman etməsi, başqalarının iman etməsinə, ibrət götürmələrinə və kafirlərin dağılmasına səbəb olmadı. Halbuki, digər üç xəlifənin imana gəlmələri islamı gücləndirdi. İmam Əli və uşaqları (radıyallahu anhum), Rəsulullahın ən yaxın əqrəbası və Rəsulullahın mübarək qanından olduqları üçün Siddiqi əkbərdən və Faruqi-əzəmdən daha üstün hesab oluna bilərsə də, bu üstünlükləri hər cəhətdən üstünlük deyildir. Hər cəhətdən o böyüklərdən öndə olmağa səbəb olmaz. Bu, Xızır əleyhissəlamın Musa əleyhissəlama bir neçə şey öyrətməsinə bənzəyir. [Qan qohumluğu cəhətindən daha yaxın olan daha üstün olsaydı, həzrəti Abbas həzrəti Əlidən daha üstün olardı. Qan cəhətindən çox yaxın olan Əbu Talibdə və Əbu Ləhəbdə isə, möminlərin ən aşağısında olan şərəf və üstünlük əsla yoxdur].

---

[1] Həsən ibn Əli hicrətin 49-cu (m. 669) ilində Mədinəyi Münəvvərədə zəhərlənərək vəfat etmişdir.

Qan qohumluğu cəhətindən yaxın olduğu üçün **həzrəti Fatimə, həzrəti Xədicə** ilə **həzrəti Aişədən** (radıyallahu anhunnə) daha üstündür. Ancaq, bir cəhətdən üstünlük, hər cəhətdən üstün olmağı göstərməz. Bu üçündən hansının ən üstün olduğuna alimlərimiz müxtəlif fikirlər bildirmişlər. Hədisi-şəriflərdən aydın olur ki, bu qadınların hər üçü, bir də **həzrəti Məryəmlə** Fironun xanımı **həzrəti Asiyə** (radıyallahu təala anhunnə əcməin), dünya qadınlarının ən üstünüdür.

Hədisi-şərifdə, **"Fatimə, Cənnət xanımlarının üstünüdür. Həsən və Hüseyn də, Cənnət gənclərinin üstünüdürlər"** buyurulur ki, bu, bir cəhətdən üstünlükdür. Bunlardan sonra, Əshabı-kiramın ən üstünləri **"Aşərəyi mübəşşərə"**dən, yəni Cənnətlə müjdələnmiş on nəfərdən olanlardır. Bunlardan sonra, Bədr döyüşündə iştirak edən üç yüz on üç nəfər üstündür.

Onlardan sonra Uhud döyüşündə iştirak edən yeddi yüz aslanın arasında olanların hamısı, daha sonra da **"Beyətur-rıdvan"**, yəni ağac altında Rəsulullaha söz verən min dörd yüz nəfər üstündür.

Rəsuli-əkrəmin (sallallahu əleyhi və səlləm) yolunda canlarını, mallarını fəda edən, Ona yardım edən Əshabı-kiramın (radıyallahu anhum əcməin) hamısının adlarını hörmətlə, sevgi ilə çəkməyimiz bizə vacibdir. Onların böyüklüyünə yaraşmayan sözlər demək əsla caiz deyildir. Adlarını hörmətsizcəsinə çəkmək zəlalət və azğınlıqdır.

Rəsulullahı sevən hər kəsin Onun Əshabının hamısını da sevməsi lazımdır. Çünki, bir hədisi-şərifdə, **"Əshabımı sevən məni sevdiyi üçün sevər. Onları sevməyən məni sevməmiş sayılır. Onları incidən, məni incidir. Məni incidən də Allahu təalanı incitmiş olar. Allahu təalanı incidən də əlbəttə əzab görəcəkdir"** buyuruldu.

Başqa bir hədisi-şərifdə də, **"Allahu təala mənim ümmətimdən bir quluna yaxşılıq etmək istəsə, onun qəlbinə Əshabımın sevgisini yerləşdirər. Onların hamısını canı kimi sevər"** buyuruldu.

Buna görə də Əshabı-kiram arasında olan müharibələri, pis niyyətlərlə və xəlifəliyi ələ keçirtmək, nəfsin arzularını yerinə yetirmək üçün etdikləri zənn edilməməlidir. Bu şəkildə zənn etmək

və buna görə o böyüklərə dil uzatmaq münafiqlikdir və fəlakətə yuvarlanmaqdır. Çünki, Rəsulullahın hüzurunda oturmaqla, Onun mübarək sözlərini eşitməklə, təəssüb [yəni inadkarlıq, gözü götürməmək], yüksək vəzifə arzusu və dünyaya düşkün olma arzuları hamısının qəlblərindən sıyrılmış, yox olmuşdu. Hərislik [ac gözlülük, tamahkarlıq], kin və pis əxlaqdan qurtulmuş, tərtəmiz olmuşdular. O uca Peyğəmbərin (sallallahu əleyhi və səlləm) ümmətinin Övliyasından biri ilə bir neçə gün birlikdə vaxt keçirən bir kimsə, o Vəlinin gözəl xasiyyətindən və üstünlüklərindən faydalanar, təmizlənər və dünyaya düşkün olmaqdan qurtular. Əshabı-kiram Rəsulullahı (sallallahu əleyhi və səlləm) hər şeydən çox sevdikləri, mallarını, canlarını Onun üçün fəda etdikləri, vətənlərini tərk etdikləri, Onun ruhlara qida olan söhbətinə aşiq olduqları halda, onların pis xasiyyətlərdən xilas ola bilmədikləri, nəfslərinin təmizlənmədiyi, fani dünya nemətləri üçün döyüşəcəkləri necə düşünülə bilər? O böyüklər, əlbəttə, hər kəsdən daha təmizdir. Onların ayrılığını, müharibələrini, bizim kimi pis niyyətli şəxslərə bənzətmək, dünya üçün, nəfslərinin çirkin istəklərinə qovuşmaq üçün döyüşdülər demək heç yaraşarmı? Əshabı-kiram haqqında bu cür çirkin şeylər düşünmək belə caiz deyildir. Belə deyən bir kəs heç düşünmür ki, Əshabı-kirama düşmənlik etmək, onları tərbiyə edən, yetişdirən Rəsulullaha (sallallahu əleyhi və səlləm) düşmənlik etmək sayılır. Onları pisləmək Rəsulullahı pisləməkdir. Bunun üçün din böyükləri buyurdular ki, "Əshabı-kiramı böyük hesab etməyən, onlara hörmət göstərməyən bir şəxs Rəsulullaha iman etməmiş deməkdir". Dəvə və Siffin müharibələri onları pisləməyə səbəb deyil. Bu müharibələrdə həzrəti Əliyə qarşı gələnlərin hamısını pis olmaqdan qurtaran, hətta savaba qovuşduran dini səbəblər vardır. Hədisi-şərifdə buyuruldu ki, **"Xəta edən müctəhidə bir savab, doğrunu tapana iki və ya on savab vardır. İki savabdan birincisi ictihad etmək savabıdır. İkincisi, doğrunu tapmaq savabıdır."** Bu din böyüklərinin aralarında olan çəkişmələr, döyüşlər, inadla, düşmənliklə deyildi, ictihadları səbəbi ilə idi. İslamiyyətin əmrinin yerinə yetirilməsini istədikləri üçün idi. Əshabı-kiramın

hər biri müctəhid idi. [Məsələn, Amr ibn Asın (radıyallahu təala anh) müctəhid olduğu, **"Hadiqa"**nın 298-ci səhifəsindəki hədi-si-şərifdə bildirilmişdir].

Hər müctəhidin öz ictihadı ilə tapdığı və bəyəndiyi bilgiyə uyğun iş görməsi fərzdir. Öz ictihadı hər nə qədər özündən daha böyük bir müctəhidin ictihadına uyğun olmasa da, yenə öz ictihadı ilə əməl etməsi lazımdır. Başqasının ictihadına əməl etməsi caiz deyildir. İmam Azam Əbu Hənifənin[1] tələbəsi olan Əbu Yusif ilə Muhamməd Şeybani və imam Muhamməd Şafiinin[2] tələbəsi olan Əbu Sevr və İsmayıl Müzəni çox yerdə şeyxlərini təqlid etmədilər. Şeyxlərinin haram dediklərindən bəzilərinə halal dedilər. Halal buyurduqlarından bəzilərinə haram dedilər. Buna görə, onların günah iş gördüklərini və pis olduqlarını demək olmaz. Bu vaxta qədər belə deyən olmamışdır. Çünki, onlar da şeyxləri kimi müctəhiddirlər.

Bəli, Əli (radıyallahu anh) Muaviyədən və Amr ibn Asdan (radıyallahu anhuma) daha yüksək və daha alim idi. Onu onlardan ayıran bir çox üstünlükləri vardır. İctihadı da o ikisinin ictihadlarından daha çox güclü və dəqiq idi. Ancaq Əshabı-kiramın hamısı müctəhid olduqları üçün, ikisinin də bu böyük imamın ictihadına əməl etmələri caiz deyildi. Öz ictihadlarına görə hərəkət etmələri lazım idi.

**Sual:** Cəməl və Siffin müharibələrində, Mühacirlərdən və Ənsardan bir çox Səhabə imam Əli ilə birlikdə idi. Ona itaət etdilər, ona tabe oldular. Onların hamısı müctəhid ikən, imam Əliyə tabe olmağı vacib bildilər. Bundan aydın olur ki, imam Əliyə tabe olmaq, müctəhid olanlara da vacib imiş. İctihadları üst-üstə düşməsə də, onunla birləşmələri lazım imiş deyilərsə:

**Cavab:** Əliyə (radıyallahu təala anh) tabe olanlar, onunla birlikdə döyüşənlər, onun ictihadına əməl etdikləri üçün birləşmədi. Öz ictihadları da İmamın ictihadına uyğun olduğu üçün, onların ictihadı imam Əliyə tabe olmağı vacib etmişdi. Bunun kimi, Əshabı-kiramın böyüklərindən çoxunun ictihadları, imam Əlinin ictihadına zidd oldu. O böyük imamla döyüşmələri vacib oldu. O dövrdə

[1] Əbu Hənifə Numan ibn Sabit hicri 150-ci (m. 767) ildə Bağdadda vəfat etmişdir.
[2] Məhəmməd ibn İdris Şafii hicri 204-cü (m. 820) ildə Misirdə vəfat etmişdir.

Əshabı-kiramın ictihadları üç cür olmuşdu. Bəziləri, imam Əlinin haqlı olduğunu anlamışdı. Bunların, imam Əliyə tabe olmaları vacib idi. Bəziləri isə, onunla döyüşənlərin ictihadını haqlı gördü. Bunların da, Əli (radıyallahu anh) ilə döyüşənlərə tabe olmaları, onunla döyüşmələri vacib oldu. Bəziləri də, hər iki tərəfə də tabe olmamaq və döyüşməmək lazımdır dedi. Bunların ictihadı, döyüşlərə qarışmamağı lazım bildi. Hər üç qrup da, əlbəttə, haqlı idi və savab qazandılar.

**Sual:** Yuxarıdakı yazı imam Əli (radıyallahu təala anh) ilə döyüşənlərin də haqlı olduğunu göstərir. Halbuki, Əhli-sünnət alimləri imam Əlinin haqlı olduğunu, qarşısındakıların səhvə düşdüklərini, üzrləri olduğu üçün bağışlandıqlarını və ya savab da aldıqlarını bildirməkdədir. Buna nə demək olar?

**Cavab:** İmam Şafii və Ömər ibn Əbdüləziz kimi din böyükləri Əshabı-kiramdan hər hansı biri üçün səhv etdi demək caiz olmaz buyurdu. Buna görə də, "Böyüklər səhv etdi demək olmaz" buyurulmuşdur. Kiçiklərin böyüklər üçün də "doğru etdi, səhv etdi, bəyəndik və ya bəyənmədik" kimi şeylər deməsi caiz deyildir. Allahu təala əllərimizi o böyüklərin qanlarına bulaşdırmadığı kimi, biz də haqlı və haqsız kimi sözləri deməkdən dillərimizi qorumalıyıq.

Dərin düşüncəli alimlər dəlilləri dərk edərək və hadisələri araşdıraraq imam Əli haqlı idi, qarşı tərəfdə olanlar səhv etdi, buyurdularsa da, bu sözləri ilə "Əli (radıyallahu anh), qarşı tərəfdə olanlarla danışa bilsəydi, onların da özü kimi ictihad etmələrini təmin edə bilərdi" demək istəmişlər. Necə ki, Zübeyr ibn Əvvam həzrətləri, dəvə müharibəsində həzrəti Əliyə qarşı olduğu halda hadisələri daha dərindən araşdıraraq, ictihadını dəyişdi, müharibədən imtina etdi. Əhli-sünnət alimlərindən xətanı caiz görənlərin sözləri belə anlaşılmalıdır. Yoxsa, həzrəti Əli və onunla birlikdə olanlar haqq yolda, qarşı tərəfdə olan Aişəyi-Siddiqə anamız və onunla birlikdə olan Əshabı-kiram batil işdə idi demək caiz deyildir.

Əshabı-kiramın bu müharibələri, əhkamı-şəriyyənin qollarında olan ictihad ayrılıqlarında idi. İslamiyyətin təməl, əsas işlərində əsla ayrılıqları yoxdu. Hal-hazırda bəziləri Muaviyə ilə Əmr ibn As

(radıyallahu anhuma) kimi din böyüklərinə dil uzadır, hörmətsizlik edirlər. Əshabı-kiramı incitməyin, Rəsulullahı (sallallahu əleyhi və səlləm) incitmək və kiçiltmək olacağını başa düşə bilmirlər. İmam Malik ibn Ənəsin "Muaviyəni və ya Əmr ibn Ası (radıyallahu anhuma)[1] söyən, pisləyən bir şəxs, özü onlara dediyi sözə layiq bir şəxsdir. Onlara qarşı ədəbsizlik edənlərə, pis söz deyənlərə və yazanlara ağır cəza vermək lazımdır" buyurduğu, **"Şəfayı-şərif"**də yazılmışdır. Allahu təala qəlblərimizi Həbibinin Əshabının sevgisi ilə doldursun! O böyükləri saleh və müttəki olanlar sevər. Münafiq və quldur olanlar sevməz. [Rəsulullahın (sallallahu əleyhi və səlləm) Əshabının dəyərlərini, üstünlüklərini anlayaraq hamısını sevənlərə, hamısına hörmət göstərənlərə və onların yolunda gedənlərə, **"Əhli-sünnət"** deyilir. Bir neçəsini sevirik, başqalarını sevmirik deyərək çoxunu pisləyənlər, beləcə heç birinin yolunda olmayan, Əshabı-kirama düşmən olanlar var. Onlar İranda, Hindistanda və İraqda çoxdur. Türkiyədə heç yoxdur. Bunlardan bəzisi yurdumuzdakı müsəlman, təmiz Ələviləri aldatmaq üçün, özlərinə **"Ələvi"** deyirlər. Halbuki, Ələvi, Əlini (radıyallahu anh) sevən müsəlman deməkdir. Bir nəfəri sevmək üçün onun yolunda olmaq, onun sevdiklərini sevmək lazımdır. Bunlar, Əlini (radıyallahu anh) sevmiş olsaydılar, onun yolunda gedərdilər. Əli (radıyallahu anh), Əshabı-kiramın hamısını sevərdi. İkinci xəlifə olan Ömərin də (radıyallahu anhuma) müşaviri, dərd ortağı idi. Fatimədən (radıyallahu anha) olan qızı Ümmü Gülsümü Ömərə (radıyallahu anh) nikahlamışdı. Xütbədə həzrəti Muaviyə haqqında "Qardaşlarımız bizdən ayrıldı. Onlar kafir və fasiq deyildir. İctihadları belə oldu" buyurdu. Ona qarşı döyüşən Talha (radıyallahu anh) şəhid olduğu zaman üzündən torpağı sildi, namazını özü qıldırdı. Allahu təala Qurani-kərimdə, **"Möminlərin qardaş olduğunu"** bildirir. Fəth surəsinin axırıncı ayəti-kəriməsi, **"Əshabı-kiramın bir-birilərini sevdiklərini"** xəbər verir. Əshabı-kiramdan birini belə sevməmək, hətta onlara düşmənlik etmək Qurani-kərimə inanmamaq demək-

[1] Muaviyə ibn Əbu Süfyan hicrətin 60-cı (m. 680) ilində Şamda vəfat etmişdir. Əmr ibn As isə 43-cü (m. 663) ildə Misirdə vəfat etmişdir.

dir. Əhli-sünnət alimləri Əshabı-kiramın (radıyallahu təala anhum əcməin) üstünlüklərini anladılar, hamısını sevməyimizi əmr etdilər, müsəlmanları fəlakətdən qurtardılar.

Əhli-beyti, yəni Əlini (radıyallahu anh) və bütün övladını, nəslini sevməyənlərə və Əhli-sünnətin göz bəbəyi olan bu böyüklərə düşmənlik edənlərə **"Xarici"** deyilir. Bu gün xaricilərə **"Yezidi"** deyilməkdədir. Yezidilərin dinləri, imanları çox yanlışdır.

Əshabı-kiramın hamısını sevirik deyib, onların yolunda olmayan, öz yanlış, səhv düşüncələrinə, Əshabın yoludur deyənlərə **"Vəhhabi"** deyilir. Vəhhabilik, məzhəbsiz din adamı Əhməd ibn Teymiyyənin kitablarındakı səhv fikrləri ilə, Hempher adlı ingilis casusunun yalanlarının qarışmasından əmələ gəldi. Vəhhabilər Əhli-sünnət alimlərini, təsəvvüf böyüklərini və şiələri bəyənmir, hamısını pisləyirlər. Ancaq özlərini müsəlman sayırlar. Özləri kimi olmayanlara müşrik deyirlər. Onların malı, canı vəhhabilərə halaldır deyirlər, **"İbahi"** olurlar. Nasslardan, yəni Qurani-kərimdən və hədisi-şəriflərdən yalnış mənalar çıxararaq, müsəlmanlığı bu mənalar zənn edirlər. Ədilləyi-şəriyyəni və hədisi-şəriflərin çoxunu inkar edirlər. Dörd məzhəbin alimləri Əhli-sünnətdən ayrılanların zəlalətə düşdüklərini, islamiyyətə çox zərər verdiklərini bir çox kitablarında dəlillərlə isbat etdilər. Daha geniş bilgi almaq üçün türkcə **"Qiyamət və Axirət"**, **"Səadəti Əbədiyyə"** kitablarını və ərəbcə **"Minhatul-vəhbiyyə"**, **"ət-Təvəssulu bin-Nəbi və bis-Salihin"**, **"Səbilun-nəcat"** və farsca **"Seyful-əbrar"** kitablarını oxuyun! Bu kitablar və bidət əhlinə rəddiyyə olaraq yazılmış bir çox qiymətli kitablar İstanbulda **"Hakikat Kitabevi"** tərəfindən çap edilmişdir. **"İbn Abidin"**in[1] üçüncü cildində asilərdən bəhs edərkən və türkcə **"Neməti islam"** kitabının nikah bəhsində, vəhhabilərin ibahi olduqları açıqca yazılmışdır.

Sultan ikinci Əbdülhəmid xanın admirallarından Eyyub Səbri Paşa[2], **"Miratul-harəmeyn"**, **"Tarixi vəhhabiyyan"** kitablarında və Əhməd Cövdət Paşa tarixinin yeddinci cildində, vəhhabilər

[1] Məhəmməd Əmin İbn Abidin 1252-ci (m. 1836) ildə Şamda vəfat etmişdir.
[2] Eyyub Səbri Paşa 1308-ci (m. 1890) ildə vəfat etmişdir.

haqqında türkcə geniş şəkildə yazmışdırlar. Yusif Nəbhaninin Misirdə nəşr edilən ərəbcə **"Şəvahidul-haqq"** kitabında vəhhabilərə və İbn Teymiyyəyə geniş bir cavab verilmişdir. Bu kitabdan əlli səhifə 1972-ci ildə İstanbulda ərəbcə nəşr etdiyimiz **"İslam alimləri və vəhhabilər"** kitabında mövcuddur.

Eyyub Səbri Paşa (rəhiməhullahu təala) yazır ki: "Vəhhabilik, 1205-ci (m. 1791) ildə Ərəbistan yarımadasında qanlı, işgəncəli bir üsyanla meydana çıxdı". Vəhhabiliyi və məzhəbsizliyi kitabları ilə dünyaya yaymağa çalışanlardan biri, Misirli Muhamməd Abduhdur. Bir mason olan və Qahirə mason lojasının rəhbəri Cəmaləddin Əfqaniyə[1] heyranlığını açıq-aşkar şəkildə yazan Abduh böyük islam alimi, mütərəqqi fikir adamı, qiymətli reformist adlanaraq gəncliyə təqdim olundu. Əhli-sünnəti yıxmaq, islamiyyəti məğlubiyyətə uğratmaq üçün pusquda duran islam düşmənləri də din adamı qılığına girərək, şirin sözlərlə müsəlmanlığı tərifləyərək, gizlicə bu fitnəni daha da qızışdırdılar. Abduhu göylərə çıxardılar. Əhli-sünnətin böyük alimlərinə, məzhəb imamlarına cahil dedilər. Onların adları belə çəkilməz oldu. Ancaq islamiyyət uğrunda qanlarını tökən, Rəsulullah (sallallahu əleyhi və səlləm) eşqinə canlarını verən əcdadımızın, şanlı-şərəfli şəhidlərin təmiz və əsil övladları, bu propaqandalara və milyonlar xərclənən reklamlara aldanmadı. Hətta, bu qondarma din qəhramanlarına məhəl qoymadı və onları tanımadı. Cənabı-Haqq şəhid balalarını alçaqcasına edilən bu hücumlardan qorudu.

Bu gün də Mövdudi[2], Seyyid Kutub[3], Həmidullah və "Təbliği camaatçı"lar kimi məzhəbsizlərin kitabları tərcümə edilərək gəncliyə təqdim olunur. Çoxlu reklamlarla şişirdilərək mədh edilən bu tərcümələrdə, islam alimlərinin bildirdiklərinə zidd olan səhv fikirlərin olduğunu görürük. Su yatar, ancaq düşmən yatmaz. Allahu təala, həbibi, çox sevdiği Peyğəmbəri Muhamməd (əleyhissəlam)

---

[1] Cəmalüddin Əfqani 1314-cü (m. 1897) ildə vəfat etmişdir.

[2] Mövdudi, Hindistandakı (Camaatul-İslamiyyə)nin qurucusudur. 1399-cu (m. 1979) da vəfat etmişdir.

[3] Seyyid Kutub 1386-cı (m. 1966) ildə Misirdə edam edilmişdir.

hörmətinə müsəlmanları qəflət yuxusundan oyandırsın! Düşmənlərin yalanlarına, iftiralarına aldanmaqdan mühafizə etsin! Amin. Yalnız dua etməklə özümüzü aldatmayaq! Allahu təalanın adəti ilahiyyəsinə riayət etmədən, səbəblərə yapışmadan, çalışmadan dua etmək, Allahu təaladan möcüzə gözləmək deməkdir. Müsəlmanlıqda, həm çalışmaq, həm də dua etmək lazımdır. Əvvəlcə səbəbdən yapışmaq, sonra da dua etmək lazımdır. Küfrdən xilas olmaq üçün birinci səbəb, islamiyyəti öyrənmək və öyrətməkdir. Hər bir halda Əhli-sünnət etiqadını və fərzləri, haramları öyrənmək, qadın-kişi hər kəsə fərzdir, birinci vəzifədir. Müasir dövrdə bunları öyrənmək çox asandır. Çünki, doğru olan din kitabı yazmaq və nəşr etmək sərbəstdir. Müsəlmanlara bu hürriyyəti verən dövlətə hər müsəlmanın yardım etməsi lazımdır.

Əhli-sünnət etiqadını və elmihalını öyrənməyən və uşaqlarına öyrətməyənlər, müsəlmanlıqdan ayrılmaq, küfr fəlakətinə düşmək təhlükəsindədirlər. Belə kəslərin duaları onsuz da qəbul olmur ki, küfrdən qoruna bilsinlər. Rəsulullah (sallallahu əleyhi və səlləm) buyurmuşdur ki, **“Elm olan yerdə müsəlmanlıq vardır. Elm olmayan yerdə müsəlmanlıq qalmaz”**. Ölməmək üçün yemək, içmək lazım olduğu kimi, kafirlərə aldanmamaq, dindən çıxmamaq üçün də dinini, imanını öyrənmək lazımdır. Əcdadımız, hər zaman toplanar, elmihal kitablarını oxuyarlar, dinlərini öyrənərdilər. Ancaq bu yolla müsəlman olaraq qaldılar, islamiyyətin ləzzətini daddılar. Bu səadət işığını bizlərə doğru olaraq çatdıra bildilər. Bizim də müsəlman qalmağımız, balalarımızı daxilimizdəki və xaricimizdəki kafirlərə yem etməməyimiz üçün birinci və ən lazımlı çarə, hər şeydən əvvəl Əhli-sünnət alimlərinin hazırladığı elmihal kitablarını oxumaq və öyrənməkdir. Övladının müsəlman olmasını istəyən valideynlər uşağına Quran öyrətməlidir. Fürsət əldə ikən oxuyaq, öyrənək və uşaqlarımıza, sözümüzü dinləyənlərə öyrədək! Məktəbə getdikdən sonra öyrənmələri çətin olur. Hətta mümkün olmur. Fəlakət gəldikdə, ah-nalə etmək fayda verməz. İslam düşmənlərinin, zındıqların şirin gələn kitablarına, qəzetlərinə, jurnal, telekanal, radio və filmlərinə aldanılmamalıdır. İbni

Abidin (rəhiməhullahu təala), üçüncü cilddə buyurur ki, "heç bir dinə inanmadığı halda, müsəlman görünüb, küfrə səbəb olan şeyləri müsəlmanlıqmış kimi izah edərək, müsəlmanları dindən çıxarmağa çalışan gizli kafirlərə **"Zındıq"** deyilir".

**Sual:** Məzhəbsizlərin yanlış kitablarından tərcümə edilmiş yazıları oxuyan bir nəfər deyir ki, "Qurani-kərim təfsirlərini oxumalıyıq. Dinimizi, Qurani-kərimi anlamağı din alimlərinə həvalə etmək, təhlükəli və qorxunc bir düşüncədir. Qurani-kərimdə "Ey din alimləri" deyilmir. "Ey iman edənlər", "Ey insanlar" kimi xitablar istifadə edilir. Buna görə də, hər müsəlman Qurani-kərimi özü başa düşməli və izahını başqasından gözləməməlidir".

Bu şəxs hər kəsin təfsir, hədis oxumağını istəyir. İslam alimlərinin, Əhli-sünnət böyüklərinin kəlam, fiqh və elmihal kitablarını oxumağı tövsiyə etmir.

Dəyanət işləri idarəsinin nəşr etdiyi Misirli Rəşid Rzanın[1] 1394 (m. 1974) tarixli və 157-ci saylı **"İslamda birlik və fiqhi məzhəblər"** kitabı da, oxuyucuları tamamilə çaşdırdı. Bu kitabın bir çox yerində, məsələn, altıncı hissəsində deyilir ki:

*"Müctəhid imamları Peyğəmbərlər (saləvatullahi təala əleyhim əcməin) qədər yüksəltdilər. Hətta, Peyğəmbərin (sallallahu təala əleyhi və səlləm) hədisinə zidd olan bir müctəhidin sözünü seçib, hədisi tərk etdilər. Bu hədisin qüvvədən düşmüş olması və ya imamımızın nəzdində başqa bir hədisin olması ehtimal edilir, dedilər.*

*Bu təqlidçilər, hökmdə xəta etməsi və ya bilməməsi caiz olan şəxslərin sözü ilə əməl edib, xətadan məsum olan Peyğəmbərin hədisini tərk etməklə, müctəhidləri təqliddən də ayrılmış olurlar. Qurandan belə ayrılmış olurlar. Müctəhid imamdan başqa heç kim Quranı başa düşə bilməz, deyirlər. Fiqhçilərin və digər təqlidçilərin buna bənzər sözləri, yəhudilərdən və xristianlardan gəldiyini göstərir. Halbuki, Quranı və hədisi başa düşmək, fiqhçilərin yazdığı kitabları başa düşməkdən daha asandır. Ərəbcə söz və üslubları yaxşı bilənlər, Quranı və hədisi başa düşmək üçün çətinlik çəkməz-*

[1] Rəşid Riza, Məhəmməd Abduhun tələbəsidir. 1354-cü (m. 1935) ildə vəfat etmişdir.

*lər. Allahu təalanın öz dinini açıqca təbliğ etməyə qadir olduğunu kim inkar edə bilər? Rəsulullahın Allahın muradını hər kəsdən yaxşı anladığını və təbliğ etməyə başqalarından daha çox qadir olduğunu kim inkar edə bilər? Həzrəti Peyğəmbərin şərhləri ümmətə kifayət etmədiyini demək, Onun təbliğ vəzifəsini tam olaraq yerinə yetirə bilmədiyini deməyə gətirib çıxarar. İnsanların çoxu, Qurani-kərimi və sünnəti başa düşməsəydilər, cənabı Haqq, o kitab və sünnətdəki hökmlər ilə bütün insanları mükəlləf tutmazdı. İnsan, inandığı şeyləri, dəlilləri ilə bilməlidir. Cənabı-Haqq təqlidçiliyi pisləmişdir. Ata-babalarını təqlid etmələrinin üzürlü sayılmayacağını açıqlamışdır. Ayələr göstərir ki, təqlid, Allah nəzdində əsla məqbul deyildir. Dinin füru qismini dəlillər vasitəsilə anlamaq, iman qismini anlamaqdan daha asandır. Çətin olanı təklif edərkən, çətin olmayanla necə mükəlləf tutmaz? Bəzi nadir hadisələrin hökmünü çıxarmaq çətin olsa da, bunları bilməmək və riayət etməmək üzr sayılar. Fiqhçilər, öz aralarında bəzi məsələlər icad etdilər. Bunlar üçün hökmlər ixtira etdilər. Bunlara rəy, qiyasi-cəli, qiyasi-xəfi kimi şeyləri dəlil gətirməyə cəhd etdilər. Bunlar, ağıl yolu ilə bilgi əldə etmək mümkün olmayan ibadətlər sahəsinə də aid edildi. Beləcə, dini genişlədərək, bir neçə qatına çıxardılar, Müsəlmanları külfətə saldılar. Mən qiyası inkar etmirəm. İbadət sahəsində qiyas yoxdur, deyirəm. İman və ibadətlər həzrəti Peyğəmbər dövründə tamamlandı. Heç kim bunlara bir şey əlavə edə bilməz. Müctəhid imamlar, insanları təqliddən çəkindirmiş, təqlidin haram olduğunu bəyan etmişlər"* deyir.

Məzhəbsiz Rəşid Rzanın "İslamda birlik və fiqhi məzhəblər" kitabından təlxis etdiyimiz yuxarıdakı yazılar, məzhəbsizlərin bütün kitabları kimi, müsəlmanların dörd məzhəb imamını təqlid etmələrini qadağan edir. Hər kəsin təfsir və hədis öyrənməsini əmr edir. Buna nə deyirsiniz?

**Cavab:** Məzhəbsizlərin yazıları diqqətlə oxunarsa, yanlış düşüncələrini və bölücü görüşlərini, çürük məntiq zəncirləri ilə və şirin sözlərlə bəzəyərək müsəlmanları aldatmağa çalışdıqları açıq şəkildə görünər. Cahillər bu yazıları ağıl və məntiq çərçivəsində,

elmə əsaslandığını zənn edərək inanırlar. Ancaq elm və iti fikir sahibləri əsla bunların tələlərinə düşməzlər.

Müsəlmanları əbədi fəlakətə sürükləyən məzhəbsizlik təhlükəsinə qarşı gəncləri diqqətli olmağa sövq etmək üçün islam alimləri (rəhiməhümullahu təala) on dörd əsrdən bəri minlərlə qiymətli kitab yazmışlar. Yuxarıdakı suala cavab olaraq, Yusif Nəbhaninin[1] **"Huccətullahi aləl-aləmin"** kitabının 771-ci səhifəsindən başlayaraq, bir qədər tərcümə etməyi münasib gördük: Qurani-kərimdən əhkam çıxarmaq, hər kəsin bacara biləcəyi bir şey deyildir. Müctəhid imamlar belə, Qurani-kərimdəki əhkamın hamısını çıxara bilməyəcəkləri üçün, Rəsulullah (sallallahu əleyhi və səlləm) Qurani-kərimdəki əhkamı hədisi-şərifləri ilə açıqlamışdır. Qurani-kərimi, ancaq Rəsulullah (sallallahu əleyhi və səlləm) açıqladığı kimi, hədisi-şərifləri də, yalnız Əshabı-kiram və müctəhid imamlar anlaya bilmişlər və açıqlamışlar. Bunu anlaya bilmələri üçün, Allahu təala müctəhid imamlara əqli və nəqli elmləri, idrak gücü və güclü yaddaş, daha çox ağıl və başqa üstünlüklər ehsan etmişdir. Bu üstünlüklərin başında təqva gəlir. Bundan sonra qəlblərindəki ilahi nur gəlir. Müctəhid imamlarımız bu üstünlüklərin yardımı ilə Allahu təalanın və Rəsulullahın kəlamlarından onların məqsədlərini anlamış, anlaşılmayanları **"Qiyas"** ilə bildirmişlər. Dörd məzhəb imamının hər biri, öz rəyi ilə danışmadığını bildirmiş və tələbələrinə "səhih hədisə rast gəlsəniz, mənim sözümü tərk edin. Rəsulullahın hədisinə əməl edin!" demişdirlər. Məzhəb imamlarımız, bu sözü, özləri kimi müctəhid olan dərin fikirli alimlərə demişdilər. Bu alimlər dörd məzhəbin dəlillərini bilən, tərcih əhli olanlardır. Müctəhid olan bu alimlər məzhəb imamının ictihadının dəlili ilə, yeni öyrənilən səhih hədisin isnadlarını, ravilərini, hansının sonra varid olduğunu və daha bir çox şərtləri araşdıraraq hansının seçiləcəyini anlayırlar. Yaxud müctəhid imam bir məsələyə dəlil olacaq hədisi-şərifə rast gəlmədiyi üçün qiyas edərək hökm etmişdir. Tələbələri bu məsələyə isnad ola biləcək hədisi-şərifi öyrənərək, başqa cür hökm vermişlər. Ancaq tələbələri belə ictihad edərkən,

[1] Yusif Nəbhani 1350-ci (m. 1932) ildə Beyrutda vəfat etmişdir.

məzhəb imamının qaydalarından kənara çıxmazlar. Daha sonra gələn müctəhid müftülər də belə fətva vermişlər. Bütün bu yazılanlardan aydın olur ki, dörd məzhəb imamlarını və onların məzhəblərində yetişmiş olan müctəhidləri təqlid edən müsəlmanlar Allahu təalanın və Rəsulunun hökmlərinə tabe olmaqdadırlar. Bu müctəhidlər Qurani-kərimdən və hədisi-şəriflərdən başqalarının anlaya bilməyəcəyi hökmləri anlamış və bunları da bildirmişlər. Müsəlmanlar da, onların kitab və sünnətdən anlayıb bildirdiklərini təqlid etmişlər. Çünki, Nəhl surəsinin 43-cü ayəti-kəriməsində məalən, **"Bilmirsinizsə, bilənlərdən soruşun!"** buyuruldu.

Bu ayəti-kərimə, hər kəsin Kitabı və Sünnəti doğru anlaya bilməyəcəyini, anlaya bilməyənlərin də olacağını göstərir. Anlaya bilməyənlərin Qurani-kərimdən və hədisi-şəriflərdən anlamağa çalışmalarını deyil, anlayanlardan soruşub öyrənmələrini əmr edir. Qurani-kərimin və hədisi-şəriflərin mənalarını hər kəs doğru başa düşə bilsəydi yetmiş iki yanlış firqə meydana çıxmazdı. Bu firqələri çıxaranların hamısı da dərin alim idi. Ancaq heç biri Nassların, yəni, Qurani-kərimin və hədisi-şəriflərin mənalarını doğru anlaya bilmədi. Səhv anlayaraq doğru yoldan ayrıldılar. Milyonlarla müsəlmanın fəlakətə yuvarlanmalarına da səbəb oldular. Nasslardan səhv mənalar çıxarmaqda, bəziləri o qədər həddi aşdılar ki, doğru yoldakı müsəlmanlara kafir, müşrik deyəcək qədər yolu azdılar. Türk dilinə tərcümə edərək, gizli şəkildə yurdumuza gətirilən **"Kəşfuş-şübuhat"** adlı vəhhabi kitabında, Əhli-sünnət etiqadında olan müsəlmanları öldürmək və mallarını yağmalamaq mubahdır deyilməkdədir.

Allahu təala məzhəb imamlarının ictihad etmələrini, məzhəblərini qurmalarını və bütün müsəlmanların bu məzhəblər çərçivəsində toplanmalarını, yalnız sevgili Peyğəmbərinin (sallallahu təala əleyhi və səlləm) ümmətinə ehsan etmişdir. Cənabı-Haqq, bir yandan etiqad imamlarını yaradaraq, yolunu azanların, zındıqların, mülhidlərin və insan şeytanlarının etiqad və iman bilgilərini pozmalarına mane olduğu kimi, məzhəb imamlarını da yaradaraq,

dinini pozulmaqdan qorumuşdur. Xristianlıqda və yəhudilikdə bu nemət olmadığı üçün dinləri pozulmuş, oyuncaq halına gəlmişdir.

Rəsulullahın (sallallahu əleyhi və səlləm) vəfatından dörd yüz il sonra, ictihad edə biləcək dərin alim qalmadığını islam alimləri yekdilliklə bildirmişlər. Hal-hazırda, ictihad etmək lazımdır deyən adamın ruhi xəstə və ya din cahili olduğu aydın olur. Böyük alim Cəlaləddin Süyuti (rəhiməhullahu təala)[1] ictihad dərəcəsinə yüksəlmiş olduğunu söyləmişdi. Öz dövrünün alimləri ondan bir sual soruşub, buna iki cür cavab verilmiş olduğunu, bunlardan hansının daha sağlam olduğunu bildirməsini istədilər. Cavab verə bilmədi. İşinin çox olduğundan, buna vaxt ayıra bilməyəcəyini bildirdi. Halbuki, ondan istənilən şey, fətvada ictihad etməsi idi. Bu isə, ictihad dərəcələrinin ən aşağısıdır. İmam Suyuti kimi dərin bir alim, fətvada ictihaddan boyun qaçırdınca, müsəlmanları mütləq ictihad etməyə sövq edənlərə dəli və ya din cahili deyilməyib, bəs nə deyilər? İmam Qazali (rəhiməhullahu təala)[2] öz dövründə müctəhid olmadığını, **"İhyaul-ulum"** kitabında bildirmişdir.

Müctəhid olmayan bir müsəlman bir səhih hədis öyrənsə, məzhəb imamının buna zidd hökmünü yerinə yetirmək ona ağır gəlsə, bu müsəlmanın dörd məzhəb arasında, bu hədisə uyğun ictihad etmiş olan müctəhidi axtarıb tapması və bu işini onun məzhəbinə görə etməsi lazımdır. Böyük alim İmam Nəvəvi (rəhiməhullahu təala)[3] **"Ravdatut-talibin"** kitabında bunu geniş şəkildə izah edir. Çünki, ictihad dərəcəsinə yüksəlməmiş olanların Kitabdan və Sünnətdən əhkam çıxarmaları caiz deyildir. Hal-hazırda, bəzi cahillər, özlərinin mütləq ictihad dərəcəsinə yüksəldiklərini, Nasslardan, yəni Kitabdan və Sünnətdən əhkam çıxara biləcəklərini və dörd məzhəbdən birini təqlid etməyə ehtiyacları qalmadığını iddia edirlər. İllərlə təqlid etmiş olduqları məzhəbi tərk edirlər. Səhv düşüncələri ilə məzhəbləri çürütməyə cəhd edirlər. Bizim kimi olan din adamlarının rəyləri ilə əməl etmərik kimi cahilcə, axmaqca şeylər

[1] Suyuti Abdurrahman 911-ci (m. 1505) ildə Misirdə vəfat etmişdir.
[2] İmam Muhəmməd Qazali 505-ci (m. 1111) ildə Tus şəhərində vəfat etmişdir.
[3] Yəhya Nəvəvi 676-cı (m. 1277) ildə Şamda vəfat etmişdir.

deyirlər. Şeytanın vəsvəsəsi və nəfslərinin təhriki ilə üstünlük iddia edirlər. Belə sözləri ilə üstünlüklərini deyil, axmaqlıqlarını və alçaqlıqlarını ortaya qoyduqlarını anlaya bilmirlər. Bunlar arasında, hər kəs təfsir oxumalı, təfsirdən və Buxaridən əhkam çıxarmalıdır, deyən və yazan cahilləri və yoldan azanları da görməkdəyik. Diqqətli ol, müsəlman qardaşım! Belə axmaqlar ilə dostluq etməkdən, bunları din adamı zənn etməkdən və qondarma kitablarını oxumaqdan çox çəkin! İmamının məzhəbinə möhkəm sarıl! Dörd məzhəbdən istədiyini və bəyəndiyini seçə bilərsən. Ancaq məzhəblərin asan hökmlərini araşdırmaq, yəni məzhəbləri **"Təlfiq"** etmək caiz deyildir. **["Təlfiq"**, məzhəblərin asan hökmlərini toplayaraq edilən bir işin bu məzhəblərdən heç birinə uyğun gəlməməsi deməkdir. Bir işi görərkən dörd məzhəbdən birinə əməl etdikdən sonra, yəni bu iş bu məzhəbə görə səhih olduqdan sonra, həmçinin digər üç məzhəbdə də səhih və məqbul olması üçün lazım olan şeylərə də, mümkün olduğu qədər riayət edilsə, buna **"Təqva"** deyilir ki, çox savab olar].

Hədisi-şərifləri oxuyub yaxşı anlayan bir müsəlmanın əvvəlcə öz məzhəbinin dəlilləri olan hədisləri öyrənməsi, sonra bu hədislərin mədh etdiyi işləri görüb, qadağan etdiyi işlərdən çəkinməsi, islam dininin böyüklüyünü, dəyərini, Allahu təalanın və Rəsulullahın (sallallahu əleyhi və səlləm) ismlərinin və sifətlərinin kamilliyini, Rəsulullahın (sallallahu əleyhi və səlləm) həyatını, fəzilətlərini, möcüzələrini, dünyanın, axirətin, Cənnətin və Cəhənnəmin hallarını, mələkləri, cinləri, keçmiş ümmətləri, Peyğəmbərləri və kitablarını, Qurani-kərimin və Rəsulullahın üstünlüklərini, Onun Alinin və Əshabının (ridvanullahi təala əleyhim əcməin) hallarını, qiyamət əlamətlərini və bir çox dünya və axirət bilgilərini öyrənməsi lazımdır. Rəsulullahın (sallallahu əleyhi və səlləm) hədisi-şəriflərində dünya və axirətin bütün bilgiləri toplanmışdır.

Bu yazdıqlarımız anlaşıldıqda, müctəhidlərin hədisi-şəriflərdən çıxardıqları dini hökmlərin faydası olmaz, deyən bir insanın nə qədər cahil olduğu ortaya çıxır. Hədisi-şəriflərin bildirdikləri saysız-hesabsız elmlər arasında ibadətləri və müamələtı bildirən

hədisi-şəriflər çox az qalmışdır. Bəzi alimlərə görə təxminən beş yüzə yaxındır. [Təkrarlanmış olanlar da əlavə edilsə, üç mini keçməz[. Bu qədər az hədisi-şərif arasından səhih bir hədisi, dörd məzhəb imamından heç birinin eşitməmiş olması düşünülə bilməz. Səhih hədisləri dörd məzhəb imamından ən az biri dəlil olaraq istifadə etmişdir. Öz məzhəbindəki bir işin, səhih olan bir hədisi-şərifə uyğun olmadığını görən bir müsəlmanın, bu hədisi-şərifə görə ictihad etmiş olan başqa bir məzhəbə əməl edərək bu işi görməsi lazımdır. Öz məzhəbinin imamı da bəlkə bu hədisi-şərifi eşitmiş, ancaq daha səhih olduğunu anladığı və ya daha sonra olub birincisini nəsh edən başqa bir hədisi-şərifə əməl edərək və yaxud müctəhidlərin biləcəyi başqa səbəblərə görə, bu hədisi dəlil olaraq istifadə etməmişdir. Bir hədisin səhih olduğunu anlayan bir müsəlmanın, məzhəbinin bu hədisi-şərifə əks düşən hökmünü tərk edib, bu hədisə əməl etməsi gözəl olsa da, bu adamın bu hədisdən hökm çıxarmış başqa məzhəbi təqlid etməsi lazımdır. Çünki, o məzhəbin imamı, əhkamın dəlillərindən onun bilmədiklərini bilərək, o hədis ilə əməl etməyə bir maneə olmadığını anlamışdır. Bununla yanaşı, bu işi öz məzhəbinə riayət edərək etməsi də caizdir. Çünki, məzhəbinin imamının o cür ictihad etməsi, mütləq sağlam bir dəlilə əsaslanmışdır. Təqlid edənin bu dəlili bilməməsini islamiyyət üzrlü saymaqdadır. Çünki, dörd məzhəb imamlarının heç biri, ictihad edərkən, Kitabdan və Sünnətdən ayrılmamışlar. Bunların məzhəbləri, Kitabın və Sünnətin izahıdır. Kitabın və Sünnətin mənalarını və hökmlərini müsəlmanlara izah etmişlər. Onların anlaya biləcəkləri şəkildə başa salmış, kitablara qeyd etmişlər. Məzhəb imamlarının "rəhiməhümullahu təala" bu işləri, islam dininə o qədər böyük bir xidmətdir ki, Allahu təala onlara yardım etməsəydi, bunu etməyə insan gücü çatmazdı. Bu məzhəblər, Rəsulullahın (sallallahu əleyhi və səlləm) haqq Peyğəmbər olduğunu və islam dininin səhih olduğunu bildirən ən güclü dəlillərdən biridir.

Din imamlarımızın ictihadlarında bir-birindən ayrılmaları, yalnız füruiddin, yəni fiqh məsələlərindədir. Üsuliddində, yəni etiqad və iman bilgilərində əsla ayrılıqları yoxdur. Dində zəruri

bilinən və dəlilləri təvatür ilə bildirilmiş hədisi-şəriflərdən alınan füru bilgilərində də ayrılıqları yoxdur. Füruiddin bilgilərinin bəzisində ayrılmışlar. Dəlillərinin qüvvətini anlamaqla bağlı ayrılıqları, buna səbəb olmuşdur. Bu kiçik ayrılıqları da, bu ümmətə rəhmətdir. Müsəlmanların, dilədikləri, asanlarına gələn məzhəbə əməl etmələri caizdir. Rəsulullah (sallallahu əleyhi və səlləm) bu ayrılığı müjdə olaraq bildirmiş və bildirdiyi kimi olmuşdur.

Qurani-kərimdə və hədisi-şəriflərdə açıq şəkildə bildirilmiş etiqad bilgilərində, yəni inanılacaq şeylərdə və fiqh bilgilərində ictihad etmək caiz deyildir. Bu, zəlalətə və yoldan azmağa gətirib çıxarar, böyük günah olar. Etiqad bilgilərində doğru olan tək yol vardır. Bu da, "Əhli-sünnət vəl-camaat" məzhəbidir. Hədisi-şərifdə, rəhmət olduğu bildirilən ayrılıq, füruda, yəni əhkamda olan ayrılıqdır.

Dörd məzhəbin əməldəki hökmlərinin ayrıldıqları bir məsələdə, aralarından ancaq birinin hökmü doğrudur. Bu doğru hökmü təqlid edənlərə iki savab, doğru olmayan hökmləri təqlid edənlərə bir savab vardır. Məzhəblərin rəhmət olması, bir məzhəbi qoyub başqa məzhəbin əməldəki hökmünü təqlid etməyin caiz olacağını göstərməkdədir. Ancaq dörd məzhəbdən başqa, Əhli-sünnətdən olan məzhəbləri və hətta Əshabı-kiramı təqlid etmək caiz deyildir. Çünki, onların məzhəbləri kitablara keçməmiş və unudulmuşdur. Bilinən dörd məzhəbdən başqasını təqlid etmək imkanı qalmamışdır. Əshabı-kiramı təqlid etməyin caiz olmadığını islam alimlərinin yekdilliklə bildirdiklərini, İmam Əbu Bəkr Razi "rəhiməhullahu təala"[1]da xəbər verməkdədir. Məzhəblərin, müctəhidlərin və xüsusilə də dörd məzhəb imamının üstünlüklərini, məzhəblərinin Kitabdan və Sünnətdən xaricə çıxmadıqlarını, icma ilə, qiyas ilə bildirdikləri hökmlərin öz rəyləri olmayıb, Kitabdan və Sünnətdən alınmış olduqlarını yaxşı başa düşmək istəyənlərə, İmam Əbdülvəhhab Şaraninin "rəhiməhullahu təala" **"Mizanul-kübra"** və **"Mizanul-xıdriyyə"** kitablarını oxumalarını tövsiyə edirik. **"Huccətullahi aləl-aləmin"** kitabından tərcümə burada tamamlandı.

[1] Əbu Bəkr Əhməd Razi 370-ci (m. 980) ildə vəfat etmişdir.

Yuxarıdakı yazıların hamısı, ərəbcə əslindən tərcümə edilmişdir. Bütün nəşrlərimizdə olduğu kimi, burada da, başqa kitablardan yazdığımız əlavələr mötərizə içinə alınmış, beləcə əlavələrimizin kitabın yazıları ilə qarışdırılmaması təmin edilmişdir. **“Huccətullahi aləl-aləmin”** kitabından götürülən yuxarıdakı yazıların ərəbcə əsli, 1394-cü ildə (m. 1974), ofset üsulu ilə İstanbulda nəşr edilmişdir.

“Qurani-kərimdə din alimləri nəzərdə tutulmur, elə bir ifadə deyilmir” sözü doğru deyildir. Müxtəlif ayəti-kərimələr, alimləri və elmi tərifləməkdədir. Əbdülqani Nablusi həzrətləri **“Hadiqa”** kitabında buyurur ki: Ənbiya surəsi, 7-ci ayəti-kəriməsində məalən, **“Bilmədiklərinizi zikr sahiblərindən soruşun!”** buyuruldu. Zikr, elm deməkdir. Bu ayəti-kərimə, bilməyənlərin, alimləri tapıb, onlardan soruşub öyrənmələrini əmr etməkdədir. Ali İmran surəsinin 7-ci ayəsində məalən, **“Mütəşabih ayələrin mənalarını ancaq elm sahibləri anlaya bilər”** və 18-ci ayəsində məalən, **“Allahu təalanın var və bir olduğunu elm sahibləri anlayar və bildirər”** və Qəsas surəsinin 81-ci ayəsində məalən, **“Elm sahibləri, onlara, sizə heyfslər olsun! İman edib, əməli saleh iş görənlərə Allahu təalanın verəcəyi savablar, dünya nemətlərindən daha yaxşıdır, dedilər”** və Rum surəsinin 56-cı ayəsində məalən, **“Elm və iman sahibləri, dünyada ikən inkar etdiyiniz qiyamət günü, bax bu gündür, deyəcəklər”** və İsra surəsinin 108-ci ayəsində məalən, **“Elm sahibləri, Qurani-kərimi eşitdikdə səcdə edərlər və “sahibimizdə heç bir qüsur yoxdur. O, verdiyi sözdən dönməz”, deyərlər”**, Həcc surəsi 54-cü ayədə məalən, **“Elm sahibləri, Qurani-kərimin Allah kəlamı olduğunu anlayarlar”**, Ənkəbut surəsinin 50-ci ayəsində məalən, **“Qurani-kərim, elm sahiblərinin qəlblərində yerləşmişdir”**, Səbə surəsinin 6-cı ayəsində məalən, **“Elm sahibləri, Qurani-kərimin Allah kəlamı olduğunu və Allahu təalanın rizasına qovuşdurduğunu bilirlər”**, Mücadələ surəsinin 11-ci ayəsində məalən, **“Elm sahiblərinə Cənnətdə yüksək dərəcələr veriləcəkdir”**, Fətir surəsinin 27-ci ayəsində məalən, **“Allahu təaladan ancaq elm sahibləri qorxar”**

və Hücurat surəsinin 14-cü ayəsində məalən, **“Ən qiymətliniz, Allahu təaladan çox qorxanınızdır”** buyurulmuşdur.

**“Hadiqa”**nın 365-ci səhifəsindəki hədisi-şəriflərdə, **“Allahu təala və mələklər və hər canlı, insanlara yaxşılıq öyrədənə dua edərlər”** və **“Qiyamət günü əvvəlcə Peyğəmbərlər, sonra alimlər, sonra şəhidlər şəfaət edəcəklər”** və **“Ey insanlar, bilin ki, elm alimdən eşidilərək öyrənilər”**, **“Elm öyrənin! Elm öyrənmək ibadətdir. Elm öyrədənə və öyrənənə cihad savabı vardır. Elm öyrətmək, sədəqə vermək kimidir. Alimdən elm öyrənmək, təhəccüd namazı qılmaq kimidir”** buyuruldu. **“Xülasə”** adlı fətva kitabının sahibi Tahir Buxari “rəhiməhullahu təala”[1] deyir ki: “Fiqh kitabı oxumaq, gecələr namaz qılmaqdan daha savabdır”. Çünki, fərzləri, haramları, [alimlərdən və ya yazdıqları kitablardan] öyrənmək fərzdir. Özünün əməl etməsi və başqalarına öyrətməsi üçün fiqh kitabları oxumaq, təsbeh namazı qılmaqdan daha savabdır. Hədisi-şəriflərdə, **“Elm öyrənmək, bütün nafilə ibadətlərdən daha savabdır. Çünki, həm özünə, həm də öyrədəcəyi insanlara faydası vardır”** və **“Başqalarına öyrətmək üçün öyrənən kəsə, Siddiqlərin savabı verilər”** buyuruldu. İslami bilgilər, ancaq müəllimdən və kitabdan öyrənilməlidir.

İslam kitablarına və rəhbərə ehtiyac yoxdur deyənlər, yalançıdır, zındıqdırlar. Müsəlmanları aldadır, fəlakətə sürükləyirlər. Din kitablarındakı bilgilər, Qurani-kərimdən və hədisi-şəriflərdən götürülmüşdür. **“Hadiqa”**-dan[2] tərcümə tamamlanmış oldu.

Allahu təala, Rəsulunu, Qurani-kərimi təbliğ etmək, öyrətmək üçün göndərdi. Əshabı-kiram, Qurani-kərimdəki bilgiləri Rəsulullahdan öyrəndilər. Din alimləri də, Əshabı-kiramdan öyrəndilər. Bütün müsəlmanlar da, din alimlərindən və onların kitablarından öyrəndilər. Hədisi-şəriflərdə **“Elm xəzinədir, açarı, soruşub öyrənməkdir”** və **“Elm öyrənin və öyrədin!”** və **“Hər şeyin qaynağı vardır. Təqvanın qaynağı, ariflərin qəlbləridir”** və **“Elm öyrətmək günahlara kəffarədir”** buyuruldu. İmam Rəbbani

---

[1] Tahir Buxari 542-ci ildə (m. 1147) vəfat etmişdir.

[2] Hədiqa əsərinin müəllifi Əbdülqani Nablusi 1143-cü (m. 1731) ildə vəfat etmişdir.

"rəhmətullahi aleyh" **"Məktubat"** adlı kitabının birinci cildi, yüz doxsan üçüncü [193] məktubunda buyurur ki: "Mükəlləf", yəni aqil və baliğ olan insan, əvvəlcə imanını, etiqadını düzəltməlidir. Yəni Əhli-sünnət alimlərinin yazdıqları əqaid bilgilərini öyrənmək və bunlara uyğun olaraq inanmaqdır. Allahu təala, o böyük alimlərin çalışmalarına bol-bol savab versin! Amin. Qiyamətdə Cəhənnəm əzabından xilas olmaq, onların bildirdiklərinə inanmağa bağlıdır. Cəhənnəmdən xilas olunacaqlar, yalnız onların yoluyla gedənlərdir. [Onların yolundan gedənlərə "Sünni" deyilir]. Rəsulullahın (sallallahu əleyhi və səlləm) və Əshabının (rıdvanullahi əleyhim əcməin) yoluyla gedənlər, yalnız onlardır. Kitabdan, yəni Qurani-kərimdən və Sünnətdən, yəni hədisi-şəriflərdən çıxarılan bilgilər içində qiymətli, doğru olan, yalnız bu böyük alimlərin, Kitabdan və Sünnətdən anlayıb bildirdikləri bilgilərdir. Çünki, hər bidət sahibi, yəni hər reformist, hər azğın və məzhəbsiz, yanlış düşüncələrini qıt ağılları ilə, Kitabdan və Sünnətdən çıxardığını iddia edir. Əhli-sünnət alimlərini kölgələməyə, alçaltmağa təşəbbüs edirlər. Deməli, Kitabdan və Sünnətdən götürüldüyü iddia edilən hər sözü, hər yazını doğru sanmaq, qulağa xoş gələn propaqandalara aldanmaq olmaz.

Əhli-sünnət vəl-camaat alimlərinin bildirdiyi doğru etiqadı izah etmək üçün, böyük alim Türpüşti həzrətlərinin farsca **"*əl-Mutəməd*"** adlı kitabı çox qiymətlidir və açıq-aydın yazılmışdır. Asan şəkildə anlaşılır. ["**Hakikat Kitabevi**", 1410-cu ildə (m. 1989) nəşr etmişdir. Fəzlullah ibn Həsən Türpüşti, Hənəfi fiqh alimlərindəndir. 661-ci (m. 1263) ildə vəfat etmişdir].

Əqaidi, yəni inanılması lazım olan bilgiləri düzəltdikdən sonra, **"Halal"**, **"Haram"**, **"Fərz"**, **"Vacib"**, **"Sünnət"**, **"Məndub"** və **"Məkruh"** olan şeyləri, Əhli-sünnət alimlərinin yazdıqları fiqh kitablarından öyrənmək və bunlara əməl etmək lazımdır. Bu alimlərin üstünlüklərini anlamayan cahillərin yazdıqları yanlış kitabları oxumamalıyıq. Allah qorusun! Etiqad ediləcək şeylərdə Əhli-sünnət məzhəbinə uyğun gəlməyən inanca sahib olan müsəlmanlar, axirətdə Cəhənnəmə girməkdən xilas ola bilməz. İmanı doğru

olanın ibadətində zəiflik olsa, tövbə etməsə belə, bağışlana bilər. Bağışlanmasa belə, əzab çəkdikdən sonra, Cəhənnəmdən xilas olar. Mühüm olan, etiqadı düzəltməkdir. Xacə Ubeydullah Əhrar (qaddəsallahu təala sirrəhul-əziz)[1] buyurdu ki: "Bütün kəşfləri və kəramətləri mənə versələr, ancaq Əhli-sünnət vəlcamaat etiqadını verməsələr, özümü xarab olmuş bilərəm. Kəşf və kəramətim olmasa, qəbahətim çox olsa, ancaq Əhli-sünnət vəl camaat etiqadını ehsan etsələr, heç üzülmərəm".

Bu gün, Hindistanda müsəlmanlar çarəsiz qalıb. Din düşmənləri hər tərəfdən hücum edir. Bu gün, islama xidmət üçün bir manat vermək, başqa zaman verilən minlərlə manatdan daha çox savabdır. İslama edilən ən böyük xidmət, Əhli-sünnət kitablarını, iman və islam kitablarını kəndlərdəki gənclərə paylamaqla olar. Hansı bəxtiyar insana bu xidmət nəsib olsa, çox sevinsin və çox şükür etsin. İslama xidmət etmək hər zaman savabdır. Ancaq İslamın zəif olduğu, yalanlarla, iftiralarla, müsəlmanlığın yox edilməyə çalışıldığı bu zamanda, Əhli-sünnət etiqadını yaymağa çalışmaq, qatbaqat daha çox savabdır. Rəsulullah (sallallahu əleyhi və səlləm), Əshabı-kiramına belə buyurdu ki, **"Siz elə bir zamanda gəldiniz ki, Allahu təalanın əmrlərindən və qadağalarından onda doqquzuna riayət edib, onda birinə riayət etməsəniz, həlak olarsınız və əzab görərsiniz! Sizdən sonra, elə bir zaman gələcək ki, o zaman, əmrlərin və qadağaların yalnız onda birinə riayət edən xilas olacaqdır"**.[**"Mişqatul-məsabih"** 1-ci cild, 179-cu səhifədə və Tirmizi, *Kitabul-fitən* 79-cu sırada mövcuddur). Bu hədisi-şərifdə bildirilən zaman, bax bu zamandır. Kafirlərlə cihad etmək, müsəlmanlara hücum edənləri tanımaq və onları sevməmək lazımdır. [Silah gücü ilə edilən cihad hökumətin işidir. Dövlətin ordusu bu işi görər. Müsəlmanların bu cür cihad etməsi, əsgər olaraq, hökumətin verdiyi vəzifəni yerinə yetirməklə olar. Cihadı-qövlinin cihadı-qətlidən, yəni söz və yazı ilə olan cihadın, gücdən istifadə edərək edilən cihaddan daha faydalı olduğu, 65-ci məktubda da yazılmışdır]. Əhli-sünnət alimlərinin kitablarını, söz-

[1] Übeydullah Əhrar 895-ci (m. 1490) ildə Səmərqənddə vəfat etmişdir.

lərini yaymaq üçün kəramət sahibi olmaq, alim olmaq şərt deyildir. Hər müsəlman bunu etmək üçün çalışmalıdır. Fürsəti qaçırmaq olmaz. Qiyamətdə hər müsəlmandan bunu soruşacaqlar və islama nə üçün xidmət etmədin? deyəcəklər. Elmihal kitablarını yaymaq üçün çalışmayanlara, din bilgilərini yayan dərnəklərə, fərdlərə yardım etməyənlərə çox əzab veriləcəkdir. Üzr və bəhanə qəbul edilməyəcəkdir. Peyğəmbərlər "əleyhimüssəlam", insanların ən üstünləri, ən qiymətliləri ikən, heç rahat oturmadı. Allahu təalanın dinini, səadəti əbədiyyə yolunu yaymaq üçün gecə-gündüz çalışdılar. Möcüzə istəyənlərə də, **"Möcüzəni Allahu təala yaradır. Mənim vəzifəm, Allahu təalanın dinini bildirməkdir"** buyururdular. Bu yolda çalışarkən, Allahu təala da onlara yardım edər, möcüzə yaradardı. Biz də, Əhli-sünnət alimlərinin "rəhiməhumullahu təala" kitablarını, sözlərini yaymalı, kafirlərin, düşmənlərin, müsəlmanlara iftira və əziyyət edənlərin, pis, alçaq, yalançı olduqlarını gənclərə və dostlara bildirməliyik. [Bunları bildirmək, qeybət sayılmaz, əmri məruf olar]. Bu yolda malı ilə, gücü ilə, məsləyi ilə çalışmayanlar, əzabdan xilas ola bilməyəcəklər. Bu yolda çalışarkən, çətinlik, işgəncə çəkmək böyük səadət, böyük qazanc sayılmalıdır. Peyğəmbərlər "əleyhimussaləvat", Allahu təalanın əmrlərini bildirərkən, cahillərin, soysuzların hücumlarına məruz qalardılar. Çox çətinlik çəkərdilər. O böyüklərin ən üstünü, seçilmişi, Allahu təalanın sevgilisi olan Muhamməd əleyhissəlam, **"Mənim çəkdiyim əziyyət kimi, heç bir Peyğəmbər əziyyət çəkmədi"** buyurdu. **"*Məktubat*"**dan tərcümə tamamlanmış oldu.

[Hər müsəlmanın, Əhli-sünnət etiqadını öyrənməsi və sözü keçənlərə öyrətməsi lazımdır. Əhli-sünnət alimlərinin sözlərini bildirən kitabları və qəzetləri tapıb almalı, bunları gənclərə və tanıdığı şəxslərə göndərməli, oxumaları üçün çalışmalıdır. İslam düşmənlərinin iç üzlərini ifşa edən kitabları da yaymalıdır].

Yer üzündə yaşayan bütün müsəlmanlara doğru yolu göstərən və Muhamməd əleyhissəlamın dinini, dəyişmədən, pozulmadan öyrənməyimizə rəhbər olan **"Əhli-sünnət alimləri**", dörd məzhəbin ictihad dərəcəsinə yüksəlmiş alimləridir. Onlardan ən böyük-

ləri, dörd böyük şəxsiyyət olub, birinciləri, **İmam Azam Əbu Hənifə Numan ibn Sabit**dir (rəhiməhullahu təala). İslam alimlərinin ən böyüklərindəndir. Əhli-sünnətin rəisidir. Tərcümeyi halı **"*Səadəti Əbədiyyə*"** və **"*Faydalı Bilgilər*"** kitablarında geniş yazılmışdır. Hicrətin səksəninci [80] ilində Kufədə doğulmuşdur, Hicrətin 150-ci (m. 767) ilində Bağdadda şəhid edilmişdir.

İkincisi, **İmam Malik ibn Ənəs** (rəhiməhullahu təala), çox böyük alimdir. Hicrətin doxsanıncı [90] ilində Mədinədə dünyaya gəlmişdir. 179-cu ildə [m. 795] də orada vəfat etdiyi, səksən doqquz il yaşadığı İbni Abidində yazılmışdır. Babası Malik ibn Əbi Amirdir.

Üçüncüsü, **İmam Muhamməd ibn İdris Şafii** (rəhiməhullahu təala), islam alimlərinin göz bəbəyidir. Yüz əllinci [150] ildə Fələstində, Qəzzədə dünyaya gəlib və 204-cü [m. 820] ildə Misirdə vəfat etmişdir.

Dördüncüsü, **İmam Əhməd ibn Hənbəl** (rəhiməhullahu təala), yüz altmış dördüncü [164] ildə Bağdadda doğulub, 241-ci ildə [m. 855] də orada vəfat etmişdir. O, İslam binasının təməl dirəyidir (rəhmətullahi əleyhim əcməin).

Dövrümüzdə, bu dörd imamdan birinə tabe olmayan müsəlman, böyük təhlükədədir. Doğru yoldan azmışdır. Onlardan başqa da çox Əhli-sünnət alimləri vardı. Onların da doğru məzhəbləri vardı. Ancaq zaman keçdikcə, məzhəbləri unudularaq, kitablara yazılmamışdır. Məsələn, **"Füqəhayi səba"** adlanan Mədinədəki yeddi böyük alim və **Ömər ibn Əbdüləziz, Süfyan ibn Üyeynə[1], İshaq ibn Rahəveyh, Davud Tai, Amir ibn Şərahili Şabi, Leys ibn Səd, Aməş, Muhamməd ibn Cərir Təbəri, Süfyani Sevri[2]** və **Abdurrahman Əvzai** "rəhiməhümullahu təala" bunlardandır.

Əshabı-kiramın hamısı (radıyallahu təala anhum əcməin), haqq yolda hidayət ulduzları idilər. Onlardan hər hansı biri, bütün dünyanı doğru yola gətirməyə kifayət idi. Müctəhid idilər. Hamısı öz məzhəbində idi. Çoxunun məzhəbləri bir-birinə bənzəyirdi. An-

[1] Süfyan ibn Üyeynə 198-ci ildə (m. 813) Məkkədə vəfat etmişdir.
[2] Süfyan Sevri 161-ci ildə (m. 778) Bəsrədə vəfat etmişdir.

caq məzhəbləri toplanmadığına, kitablara yazılmadığına görə, onlara tabe olmağımız mümkün deyildir. Dörd imamın məzhəblərini, yəni inanılacaq və əməl ediləcək şeylərdə bildirdiklərini, özləri və tələbələri toplamış, açıqlamış və kitablara yazmışlar. Bu gün, hər müsəlmanın, adı keçən dörd imamdan birinin məzhəbində olması, bu məzhəbə görə yaşaması və ibadət etməsi lazımdır. [Bu dörd məzhəbdən birinə tabe olmaq istəməyən, **"Əhli-sünnət"** deyildir. Başlanğıc hissədə ikinci səhifəyə baxın!]

Bu dörd imamın tələbələrindən ikisi, iman bilgilərini yaymaqda çox yüksəldilər. Beləliklə, etiqadda, imanda məzhəb iki oldu. Qurani-kərimə və hədisi-şəriflərə uyğun doğru iman, ancaq bu ikisinin bildirdiyi imandır. Firqəyi-naciyyə olan Əhli-sünnətin iman bilgilərini yer üzünə yayan, bu ikisidir. Biri **Əbul-Həsən Əşari** "rəhiməhullahu təala" olub, hicrətin 266-cı ilində Bəsrədə doğulmuş, 330-cu (m. 941) ildə də Bağdadda vəfat etmişdir. İkincisi, **Əbu Mənsuri Maturidi** "rəhiməhullahu təala" olub, 333-cü [m. 944] ildə Səmərqənddə vəfat etmişdir. Hər müsəlmanın etiqadda, bu iki böyük imamdan birinə tabe olması lazımdır.

Övliyanın yolları haqdır. İslamiyyətdən zərrə qədər ayrılıqları yoxdur. [Dini, dünya qazanclarına vəsilə edən, mal, vəzifə əldə etmək üçün vəli, mürşid və din adamı olaraq ortaya çıxan yalançılar və yolunu azanlar hər əsrdə vardı. Bu gün də, hər məsləkdə, hər sənətdə və hər vəzifədə pis insanlar da var. Qazanclarını, səfalarını başqalarının zərərlərində axtaranları görərək, bunların qarışdıqları vəzifəliləri və məsləklərin hamısını ləkələmək, haqsızlıq və cahillik, həmçinin fəsadçılara yardım etməkdir. Bunun üçün, azğın din adamlarını, cahil və saxta təriqətçiləri görərək, islam alimlərini, təsəvvüf əhlini və xidmətləri tarixdə şərəfli səhifələr doldurmuş böyük şəxsiyyətləri ləkələmək olmaz. Onları ləkələyənlərin haqsız olduqlarını anlamaq lazımdır.] Övliyanın kəramətləri vardır. Hamısı haqdır və doğrudur. İmam Yafii[1] buyurdu ki, "Qövsus-səqaleyn mövlanə Əbdülqadiri Geylaninin (qaddəsallahu təala sirrə-

[1] Abdullah Yafii 768-ci (m. 1367) ildə Məkkədə vəfat etmişdir.

hul-əziz)[1] kəramətləri, dildən-dilə o qədər yayılmışdır ki, buna şübhə etmək, inanmamaq olmaz. Çünki, hər yerdə yayılmaq, yəni **"Təvatür"**, sənəd kimidir".

Namaz qılan bir adamın, küfr olan bir şeyi, açıq şəkildə və zərurətsiz deyərək və ya istifadə edərək, kafir olduğu aydın olmadıqca, başqalarını təqlid edərək, buna kafir demək caiz olmaz. Kafir olaraq öldüyü bilinmədikcə lənət etmək olmaz. Kafirə belə lənət etmək caiz deyildir. Bunun üçün, Yezidə lənət etməmək daha yaxşıdır.

5 - İman edilməsi lazım olan altı şeydən beşincisi **"Axirət gününə inanmaqdır"**. Bu zamanın başlanğıcı, insanın öldüyü gündür, qiyamətin sonuna qədərdir. Ardından gecə gəlmədiyi üçün və ya dünyadan sonra gəldiyi üçün sonuncu gün deyilir. Hədisi-şərifdə bildirilən bu gün, bildiyimiz gecə-gündüz deyildir. Bir vaxt, bir zaman deməkdir. Qiyamətin nə zaman qopacağı bildirilmədi, vaxtını heç kim anlaya bilmədi. Ancaq Peyğəmbərimiz (sallallahu əleyhi və səlləm), bir çox əlamətlərini və başlanğıclarını xəbər verdi: Həzrəti Mehdi gələcək, İsa əleyhissəlam səmadan Şama enəcək, Dəccal çıxacaq. Yəcuc-Məcuc adlanan kəslər hər yeri qarışdıracaq. Günəş qərbdən doğacaq. Böyük zəlzələlər olacaq. Din bilgiləri unudulacaq. Fisq və pislik çoxalacaq. Dinsiz, əxlaqsız və namussuzlar əmir olacaq, Allahu təalanın əmrləri yerinə yetirilməyəcək. Haramlar hər yerdə işlənəcək, Yəməndən bir od çıxacaq. Göylər və dağlar parçalanacaq. Günəş və Ay qaralacaq. Dənizlər bir-birinə qarışacaq və qaynayıb quruyacaqdır.

Günah işləri görən müsəlmanlara **"Fasiq"** deyilir. Fasiqlərə və bütün kafirlərə qəbirdə əzab vardır. Bunlara əlbəttə inanmaq lazımdır. Meyit qəbrə qoyulduqda, bilinməyən bir həyat ilə diriləcək, rahatlıq və ya əzab görəcəkdir. Münkər və Nəkir adlı iki mələyin, bilinməyən qorxunc insan şəklində qəbrə gəlib sual soruşacaqlarını hədisi-şəriflər açıq şəkildə bildirməkdədir. Qəbir sualı, bəzi alimlərə görə, bəzi əqaiddən olacaq, bəzilərinə görə isə, bütün əqaiddən olacaqdır. [Buna görə də, uşaqlarımıza "Rəbbin kimdir? Dinin hansı dindir? Kimin ümmətindənsən? Kitabın nədir? Qiblən hara-

[1] Əbdülqadir Geylani 561-ci (m. 1161) ildə Bağdadda vəfat etmişdir.

dır? Etiqadda və əməldə məzhəbin nədir?" suallarının cavablarını öyrətməliyik! Əhli-sünnət olmayanın doğru cavab verə bilməyəcəyi "***Təzkirəyi Kurtubi***"də[1] yazılmışdır.] Gözəl cavab verənlərin qəbri genişlənəcək, buraya Cənnətdən bir pəncərə açılacaqdır. Səhər-axşam, Cənnətdəki yerlərini görəcək, mələklər tərəfindən onlara yaxşılıqlar ediləcək, müjdələr veriləcəkdir. Yaxşı cavab verə bilməsə, dəmir dəyənəklərlə elə vurulacaq ki, bağırmağını, insandan və cindən başqa hər məxluq eşidəcəkdir. Qəbir o qədər daralar ki, sümüklərini bir-birinə keçirəcək kimi sıxar. Cəhənnəmdən bir pəncərə açılar. Səhər-axşam Cəhənnəmdəki yerini görüb, məzarda məhşərə qədər ağır əzablar çəkər.

Öldükdən sonra yenə dirilməyə inanmaq lazımdır. Sümüklər, ətlər çürüyüb torpaq və qaza çevrildikdən sonra, bədənlər təzədən yaradılacaq, ruhlar bədənlərinə qayıdıb, hər kəs qəbirdən qalxacaqdır. Buna görə, bu zamana **"Qiyamət günü"** deyilir.

[Bitkilər havadan karbon dioksid qazını və torpaqdan su ilə duzları, yəni torpaq maddələrini alıb, bunları birləşdirirlər. Beləliklə, orqanik cisimləri və əzalarımızın təməl daşlarını meydana gətirirlər. İllərlə uzun sürən bir kimyəvi reaksiyanın, katalizator sayəsində, saniyədən daha az bir müddətdə əmələ gəlməsi, müasir dövrdə bilinməkdədir. Elə bunun kimi Allahu təala, qəbirdə su, karbon dioksid və torpaq maddələrini birləşdirərək orqanik maddələri və canlı üzvləri bir anda yaradacaqdır. Belə diriləcəyimizi, Müxbiri-sadiq xəbər verir. Dəqiq elmlər də, bunun dünyada onsuz da baş verdiyini göstərir].

Bütün canlılar, **"Məhşər"** yerində toplanacaq. Hər insanın əməl dəftərləri uçaraq sahibinin yanına gələcəkdir. Bunları, yerləri, göyləri, zərrələri, ulduzları yaradan, sonsuz qüdrət sahibi Allahu təala edəcəkdir. Bunların olacağını, Allahu təalanın Rəsulu (sallallahu təala əleyhi və səlləm) xəbər vermişdir. Onun söylədikləri əlbəttə doğrudur. Əlbəttə hamısı olacaqdır.

---

[1] Təzkirənin müəllifi Muhəmməd Kurtubi Maliki 671-ci ildə (m. 1272) vəfat etmişdir. "***Müxtəsəri Təzkirəyi Kurtubi***" Hakikat Kitabevi tərəfindən 1421-ci (m. 2000) ildə yenidən çap edilmişdir.

Salehlərin və yaxşıların dəftəri sağ tərəfindən, fasiqlərin, pislərin arxa və ya sol tərəfindən veriləcəkdir. Yaxşı və pis, böyük və kiçik, gizli və açıq edilən hər şey dəftərdə olacaqdır. **“Kiramən katibin”** mələklərinin bilmədiyi işlər belə, orqanlarımızın xəbər verməsi ilə və ya Allahu təalanın bildirməsi ilə ortaya çıxarılacaq, hər şey haqqında sual və hesab soruşulacaqdır. Məhşərdə, Allahu təalanın dilədiyi hər gizli şey meydana çıxacaqdır. Mələklərə, yerlərdə, göylərdə nələr etdiniz? Peyğəmbərlərə “saləvatullahi təala və təslimatuhu əleyhim əcməin”, Allahu təalanın hökmlərini Onun qullarına necə çatdırdınız? Hər kəsə də, Peyğəmbərlərə necə tabe oldunuz, sizə bildirilən vəzifələri necə yerinə yetirdiniz? Bir-birinizin haqlarına necə riayət etdiniz, deyə soruşulacaqdır. Məhşərdə, imanı olan, əməli və əxlaqı gözəl olanlara mükafat və ehsanlar olacaq, pis xasiyyətli və pis əməlli olanlara ağır cəzalar veriləcəkdir.

Allahu təala, dilədiyi möminlərin böyük-kiçik bütün günahlarını, fəzli və ehsanı ilə bağışlayacaqdır. Şirkdən və küfrdən başqa, hər günahı, istəsə bağışlayacaq, istəsə ədaləti ilə kiçik günahlar üçün də əzab edəcəkdir. Müşrik və kafir olaraq öləni əsla əfv etməyəcəyini bildirməkdədir. Kitablı və kitabsız kafirlər, yəni Muhamməd əleyhissəlamın bütün insanlara Peyğəmbər olduğuna inanmayan, Onun bildirdiyi əhkamdan, yəni əmr və qadağalardan birini belə bəyənməyənlər, bu halda ölsələr, əlbəttə Cəhənnəmə atılacaq, əbədi əzab çəkəcəklər.

Qiyamət günü, əməlləri və işləri ölçmək üçün, bilmədiyimiz bir **“Mizan”**, bir ölçü aləti, bir tərəzi vardır. Yer və göy bir gözünə sığar. Savab gözü parlaq olub, Ərşin sağında, Cənnət tərəfindədir. Günah tərəfi qaranlıq olub, Ərşin solunda, Cəhənnəm tərəfindədir. Dünyada edilən işlər, sözlər, düşüncələr, baxışlar, orada şəkil dəyişərək, yaxşılıqlar parlaq, pisliklər qaranlıq və iyrənc görünüb, bu tərəzidə çəkiləcəkdir. Deyilmişdir ki, bu tərəzi, dünya tərəzilərinə oxşamaz. Ağır tərəfi yuxarı qalxar. Yüngül tərəfı aşağı düşər. Alimlərin “rəhiməhumullahu təala” bəzilərinə görə, müxtəlif tərəzilər olacaqdır. Bir çoxu da, tərəzilərin neçə dənə və necə olduqları

barədə dində açıq bir məlumatın olmamasına görə, bunları düşünməmək lazım olduğunu ifadə etmişlər.

**"Sirat körpüsü"** vardır. Sirat körpüsü, Allahu təalanın əmri ilə, Cəhənnəmin üzərində qurulacaqdır. Hər kəsə, bu körpüdən keçməsi əmr olunacaqdır. O gün, bütün Peyğəmbərlər **"ya Rəbb! Səlamət ver!"** deyə yalvaracaqlar. Cənnətlik olanlar, körpüdən rahat bir şəkildə keçərək, Cənnətə gedəcəklər. Bunlardan bəzisi ildırım kimi, bəzisi külək kimi, bəzisi çapar at kimi keçəcəkdir. Sirat körpüsü qıldan incə, qılıncdan itidir. Dünyada islamiyyətə riayət etmək də belədir. İslamiyyətə tamamilə riayət etməyə çalışmaq, Sirat körpüsündən keçmək kimidir. Burada, nəfs ilə mübarizənin çətinliyinə sinə gərən, orada Siratı asan və rahat keçəcəkdir. İslamiyyətə riayət etməyən, nəfslərinə düşkün olanlar, Siratı çətin keçəcəklər. Buna görədir ki, Allahu təala islamiyyətin göstərdiyi doğru yola **"Sıratı-müstəqım"** adını verdi. Bu ad bənzərliyi də, islamiyyət yolunda olmağın, Sirat körpüsünü keçmək kimi olduğunu göstərməkdədir. Cəhənnəmlik olanlar, Siratdan keçə bilməyib, Cəhənnəmə düşəcəklər.

Peyğəmbərimiz Muhamməd Mustafaya (sallallahu əleyhi və səlləm) məxsus olan **"Kövsər hovuzu"** vardır. Böyüklüyü, bir aylıq yol qədərdir. Suyu süddən daha bəyaz, ətri müşgdən daha gözəldir. Ətrafındakı qədəhlər, ulduzlardan daha çoxdur. Bir dəfə içən, Cəhənnəmdə olsa belə, bir daha susamaz.

**"Şəfaət"** haqdır. Tövbəsiz ölən möminlərin kiçik və böyük günahlarının əfv olunması üçün, Peyğəmbərlər, Vəlilər, Salehlər, Mələklər və Allahu təalanın izn verdiyi kəslər şəfaət edəcək və qəbul ediləcəkdir. (Peyğəmbərimiz (sallallahu təala əleyhi və səlləm), **"Ümmətimdən böyük günah iş görənlərə şəfaət edəcəyəm"** buyurmuşdur). Məhşərdə, şəfaət beş cürdür: **Birincisi**, qiyamət günü, məhşər yerində izdihamdan, uzun müddət gözləməkdən bezən günahkarlar fəryad edərək, hesabın dərhal çəkilməsini istəyəcəklər. Bunun üçün şəfaət olunacaqdır. **İkincisi**, sualın və hesabın asan və tez olması üçün şəfaət ediləcəkdir. **Üçüncüsü**, günahı olan möminlərin, Siratdan Cəhənnəmə düşməmələri, Cəhənnəm əzabından qo-

runmaları üçün şəfaət olunacaqdır. **Dördüncüsü**, günahı çox olan möminləri Cəhənnəmdən çıxarmaq üçün şəfaət olunacaqdır. **Beşincisi**, Cənnətdə saysız-hesabsız nemətlər olacaq və həyat əbədi olacaqsa da, səkkiz dərəcəsi vardır. Hər kəsin dərəcəsi, məqamı, imanının və əməllərinin miqdarına görə olacaqdır. Cənnətdəkilərin dərəcələrinin yüksəlmələri üçün də şəfaət olunacaqdır. Cənnət və Cəhənnəm hal-hazırda da vardır. Cənnət, yeddi qat göyün üstündədir. Cəhənnəm, hər şeyin altındadır. Səkkiz Cənnət, yeddi Cəhənnəm vardır. Cənnət, yer kürəsindən, günəşdən və göylərdən daha böyükdür. Cəhənnəm də günəşdən böyükdür.

6 - İnanılması lazım olan altı şeydən altıncısı**-"təqdirə, xeyir və şərlərin Allahu təaladan olduğuna inanmaqdır"**. İnsanlara gələn xeyir və şər, fayda və zərər, qazanc və ziyanların hamısı, Allahu təalanın təqdir etməsi ilədir. **"Qədər"**, lüğətdə bir çoxluğu ölçmək, hökm və əmr deməkdir. Çoxluq və böyüklük mənasına da gəlir. Allahu təalanın, bir şeyin varlığını əzəldə diləməsinə qədər deyilmişdir. Qədərin, yəni varlığı istənilən şeyin var olmasına **"Qəza"** deyilir. Qəza və qədər sözləri, bir-birinin yerində də istifadə edilir. Buna görə qəza, əzəldən əbədə qədər yaradılacaq şeyləri, Allahu təalanın əzəldə diləməsidir. Bütün bu cisimlərin, qəzaya uyğun olaraq, daha az və daha çox olmayaraq yaradılmasına qədər deyilir. Allahu təala, olacaq hər şeyi əzəldə, sonsuz keçmişdə bilirdi. Allahın bu bilgisinə **"Qəza və qədər"** deyilir. Qədim Yunan fəlsəfəçiləri buna "inayəti əzəliyyə" demişlər. Bütün varlıqlar, o qəzadan meydana gəlmişdir. Əzəldəki elminə uyğun olaraq, əşyanın var olmasına da "Qəza və qədər" deyilir. Qədərə iman etmək üçün yaxşı bilmək və inanmaq lazımdır ki, Allahu təala, bir şeyi yaradacağını əzəldə iradə etmiş və diləmişsə, az və ya daha çox olmadan, dilədiyi kimi var olması lazımdır. Olmasını dilədiyi şeylərin var olmaması və yoxluğunu dilədiyi şeyin var olması mümkün deyildir.

Bütün heyvanların, bitkilərin, cansız varlıqların [bərk cisimlərin, mayelərin, qazların, ulduzların, molekulların, atomların, elektronların, elektromaqnit dalğaların, qısaca hər varlığın hərəkə-

ti, fiziki hadisələri, kimyəvi reaksiyaları, nüvə reaksiyaları, enerji mübadilələri, canlılardakı fizioloji fəaliyyətləri], hər şeyin olub-olmaması, qulların yaxşı və pis işləri, dünyada və axirətdə onların cəzasını görmələri və hər şey əzəldə Allahu təalanın elmində var idi. Bunların hamısını əzəldə bilirdi. Əzəldən əbədə qədər olacaqları, cisimləri, xüsusiyyətləri, hərəkətləri və hadisələri əzəldə bildiyinə uyğun olaraq yaratmaqdadır. İnsanların yaxşı və pis bütün işlərini, müsəlman olmalarını, küfrlərini, istəkli və istəksiz bütün işlərini Allahu təala yaratmaqdadır. Yaradan və edən yalnız Odur. Səbəblərin əmələ gətirdiyi hər şeyi yaradan Odur. **"Hər şeyi bir səbəb ilə yaratmaqdadır."** Məsələn, od yandırıcıdır. Halbuki, yandıran Allahu təaladır. Odun yandırmaqla heç bir əlaqəsi yoxdur. Ancaq adəti belədir ki, bir şeyə od dəymədikcə, yandırmağı yaratmaz. [Od, alışma temperaturuna qədər isitməkdən başqa bir şey edə bilməz. Üzvi maddələrin quruluşunda olan karbona, hidrogenə oksigenlə birləşmək xassəsini verən, elektron mübadilələrini təmin edən od deyildir. Doğrunu görə bilməyənlər, bunu odun etdiyini zənn edir. Yandıran, yanma reaksiyasını verən od deyildir, oksigen də deyildir, istilik də deyildir, elektron mübadiləsi də deyildir. Yandıran yalnız Allahu təaladır. Bunların hamısını yanmaq üçün səbəb olaraq yaratmışdır. Bilgisi olmayan adam odun yandırdığını zənn edir. İbtidai sinfi başa vuran bir şagird, "od yandırır" sözü ilə razılaşmayaraq, havanın yandırdığını deyir. Orta siniflərdə oxuyan da, bunu qəbul etmir. Havadakı oksigen yandırır, deyir. Orta məktəbi bitirən şagird də, yandırıcılıq qabiliyyəti oksigenə məxsus deyildir. Hər elektron çəkən element yandırcıdır, deyir. Universitet tələbəsi isə maddə ilə birlikdə enerjini də hesaba qatır. Görünür ki, elm inkişaf etdikcə, işin əslinə yaxınlaşmaqda, səbəb zənn edilən şeylərin arxasında, daha hansı səbəblərin olduğu aydın olmaqdadır. Elmin və fənnin ən yüksək dərəcəsində olan və həqiqətləri tamamilə görən Peyğəmbərlər (əleyhimüssəlam) və O böyüklərin izindən gedərək, elm dəryalarından damlalara qovuşan islam alimləri (rəhiməhumullahu təala), bu gün yandıran və ya əmələ gətirdiyi zənn edilən şeylərin, aciz, zavallı bir vasitə və məxluq olduqlarını,

həqiqi əmələ gətirənin və yaradanın səbəblər deyil, Allahu təala olduğunu bildirirlər]. Yandıran Allahu təaladır, odsuz da yandırar. Ancaq odla yandırmaq adətidir. Yandırmaq istəməsə, od da yandıra bilməz. İbrahim əleyhissəlamı odda yandırmadı. Onu çox sevdiyi üçün adətini pozdu. [Belə ki, odun yandırmasının qarşısını alan maddələr də yaratmışdır. Bu maddələri kimyagərlər tapmaqdadırlar].

Allahu təala diləsəydi hər şeyi səbəbsiz yaradardı, odsuz yandırardı, yemədən doyuzdurardı, təyyarəsiz uçurardı, radiosuz uzaqdan eşitdirərdi. Lakin lütf edərək, qullarına yaxşılıq edərək, hər şeyi yaratmasını bir səbəbə bağladı. Müəyyən şeyləri, müəyyən səbəblərlə yaratmağı dilədi. İşlərini səbəblərin altında gizlədi. Qüdrətini səbəblər altında saxladı. Onun bir şeyi yaratmasını istəyən, o şeyin səbəbinə yapışar, o şeyə qovuşar. [Lampanı yandırmaq istəyən kibritdən istifadə edər. Zeytun yağı çıxarmaq istəyən, sıxma alətindən istifadə edər. Başı ağrıyan dərman içər. Cənnətə gedib, sonsuz nemətlərə qovuşmaq istəyən, islamiyyətə tabe olar. Özünü tapanca ilə vuran ölər, zəhər içən ölər. Tərli halda su içən, xəstə olar. Günah iş görən, imanını yox edən də Cəhənnəmə gedər. Hər kəs, hansı səbəbə müraciət etsə, o səbəbin vasitə olduğu şeyə qovuşar. Müsəlman kitablarını oxuyan, müsəlmanlığı öyrənər, sevər və müsəlman olar. Dinsizlərin və məzhəbsizlərin arasında yaşayan, onların sözlərini dinləyən, din cahili olar. Din cahillərinin çoxu kafir olur. İnsan hansı yerin nəqliyyatına minərsə, oraya gedər].

**Haqq təcəlli eyləyincə, hər işi asan edər,**
**Xəlq edər səbəbini (əsbabını), bir anda(ləhzədə) ehsan edər.**

Allahu təala işlərini səbəblərlə yaratmasaydı, heç kim heç kəsə möhtac olmazdı. Hər kəs, hər şeyi Allahu təaladan istəyər, heç bir şeyə müraciət etməzdi. Bu halda, insanlar arasında əmir, məmur, işçi, sənətkar, tələbə, müəllim və başqa insanlıq əlaqələri qalmaz, dünya və axirətin nizam-intizamı pozulardı. Gözəl ilə çirkin, yaxşı ilə pis və itaətkarla üsyankar arasında fərq qalmazdı.

Allahu təala diləsəydi, adətini başqa cür qoyardı. Hər şeyi, o adətinə görə yaradardı. Məsələn, diləsəydi, kafirləri, dünyada zövq

və səfasına düşkün olanları, insanları incidənləri və aldadanları Cənnətə salardı. İmanı olanları, ibadət edənləri, yaxşılıq edənləri də Cəhənnəmə atardı. Ancaq ayəti-kərimələr və hədisi-şəriflər belə diləmədiyini göstərir.

İnsanların hər işini, istəkli və istəksiz bütün hərəkətlərini yaradan Odur. Qulların ixtiyari, yəni istəkli hərəkətlərini və işlərini yaratması üçün qullarında **"İxtiyar"** və **"İradə"** yaratmış, bu seçim və arzularını işləri yaratmasına səbəb qoymuşdur. Bir qul, bir şey etmək istədikdə, arzu etdikdə Allahu təala da diləsə, o işi yaradar. Qul istəməsə, Allahu təala da diləməsə, o şeyi yaratmaz. O şey, yalnız qulun istəməsi ilə də yaradılmaz. Allah da dilərsə yaradar. Qullarının istəkli işlərini yaratması, bir şeyə od dəysə, o şeydə yandırmağı yaratması, od dəyməzsə, yandırmağı yaratmaması kimidir. Bıçaq dəydikdə, kəsməyi yaradır. Kəsən, bıçaq deyildir, Odur. Bıçağı kəsmək üçün səbəb yaratmışdır. Deməli, qulların istəkli hərəkətlərini onların ixtiyar etmələri, hərəkəti seçmələri və istəmələri səbəbi ilə yaradır. Ancaq təbiətdəki hərəkətlər, qulların ixtiyar etmələrinə bağlı deyildir. Bunlar, yalnız Allahu təala dilədikdə başqa səbəblərlə yaradılmaqdadır. Hər şeyin, günəşin, zərrələrin, damcıların, hüceyrələrin, mikrobların və atomların maddələrini, xassələrini, hərəkətlərini yaradan yalnız Odur. Ondan başqa yaradan yoxdur. Ancaq cansız maddələrin hərəkətləri ilə, insan və heyvanların ixtiyari, istəkli hərəkətləri arasında fərq budur ki, qullar bir şeyi etməyi ixtiyar etdikdə və dilədikdə, O da diləsə, qulu hərəkət etdirir və yaradır. Qulun hərəkət etməsi qulun əlində deyildir. Hətta, necə hərəkət etdiyindən xəbəri belə yoxdur. [İnsanın hər hərəkəti müxtəlif fiziki və kimyəvi hadisələrlə əmələ gəlir]. Cansızların hərəkətlərində **"İxtiyar etmək"** yoxdur. Od dəydiyi zaman, yandırmağın yaradılması, odun yandırmağı seçməsi və diləməsi ilə deyildir.

[Sevdiyi, rəhm etdiyi qullarının yaxşı və faydalı istəklərini, O da istəyir və yaradır. Bunların pis və zərərli istəklərini, O istəmir və yaratmır. Bu qullarından daim yaxşı və faydalı işlər hasil olur. Onlar bir çox işlərinin baş vermədiyinə kədərlənirlər. Bu işlərin

zərərli olduqları üçün yaradılmadığını düşünüb anlasaydılar, əsla kədərlənməzdilər. Bunun üçün sevinər və Allahu təalaya şükür edərdilər. Allahu təala insanların ixtiyari və istəkli işlərini, onların qəlblərinin ixtiyar və iradə etmələrindən sonra yaratmağı, əzəldə iradə etmiş, belə olmasını diləmişdir. Əzəldə belə diləməsəydi, istəkli hərəkətlərimizi də biz istəmədən həmişə O məcburən yaradardı. İstəkli işlərimizi biz istədikdən sonra yaratması, əzəldə, belə istəmiş olduğu üçündür. Deməli, Onun iradəsi hakimdir].

Qulların istəkli hərəkətləri iki şeydən əmələ gəlir: Birincisi, qulun qəlbinin ixtiyar, iradə və qüdrəti ilədir. Bunun üçün qulun hərəkətlərinə **"Kəsb etmək"** deyilir. Kəsb, insanın sifətidir. İkincisi, Allahu təalanın yaratması, var etməsi ilədir. Allahu təalanın əmrlər, qadağalar, savablar və əzablar yaratması insanda kəsb olduğu üçündür. **"Saffət"** surəsinin 96-cı ayəti-kəriməsində məalən, **"Allahu təala sizi yaratdı və işlərinizi yaratdı"** buyuruldu. Bu ayəti-kərimə insanlarda kəsb, yəni hərəkətlərində qəlbinin ixtiyarı və **"İradəyi-cüziyyə"**si olduğunu göstərir və məcburiyyət olmadığını açıq şəkildə isbat edir. Buna görə **"İnsanın işi"** deyilir. Məsələn, Əli vurdu, qırdı deyilir. Həm də hər şeyin qəza və qədərlə yaradıldığını bəlli edir.

Qulun işinin görülməsində və yaradılmasında, əvvəlcə bu işi qulun qəlbinin ixtiyar və iradə etməsi lazımdır. Qul, qüdrəti daxilində olan şeyi iradə edir. Bu istəyə və diləməyə **"Kəsb"** deyilir. Mərhum Amidi, bu kəsbin işlərin yaradılmasına səbəb olduğunu, təsir etdiyini bildirir. Bu kəsbin ixtiyari olan işin yaradılmasına təsiri olmaz demək də mümkündür. Çünki, yaradılan işlə qulun istədiyi iş, fərqli şeylər deyildir. Deməli, qul hər istədiyini edə bilməz, istəmədikləri də var ola bilər. Qulun, hər istədiyini etməsi, hər istəmədiyinin olmaması, qulluq deyildir, uluhiyyətə cəhd etməkdir. Allahu təala lütf edərək, ehsan edərək, rəhm edərək qullarına möhtac olduqları qədər və əmrlərə, qadağalara riayət edə biləcək qədər güc və qüdrət, yəni enerji vermişdir. Məsələn, sağlamlığı və pulu olan bir müsəlman ömründə bir dəfə həccə gedə bilər. Göydə Ramazan hilalını [ayı] görəndə hər il bir ay oruc tuta bilər. İyirmi

dörd saatda beş vaxt fərz olan namazı qıla bilər. Nisab miqdarı malı və pulu olan, bir hicri il sonra, bunun qırxda bir miqdarında qızıl və gümüşü ayırıb müsəlmanlara zəkat verə bilər. Görünür ki, insan öz istəkli işlərini istəsə edər, istəməsə etməz. Allahu təalanın böyüklüyü, buradan da aydın olur. Cahil və axmaq olanlar qəza və qədər bilgilərini anlaya bilmədikləri üçün Əhli-sünnət alimlərinin sözlərinə inanmır, qulların qüdrət və ixtiyarlarında şübhə edirlər. İnsanı istəkli işlərində aciz və məcbur zənn edirlər. Bəzi işlərdə qulların ixtiyarı olmadığını görərək, Əhli-sünnətə dil uzadırlar. Bu yanlış sözləri özlərində iradə və ixtiyar olduğunu göstərir.

Bir işi edib-etməməyə gücü çatmağa **"Qüdrət"** deyilir. Etməyi və ya etməməyi seçməyə **"İxtiyar"**, istəmək deyilir. İxtiyar olunanı etməyi diləməyə **"İradə"**, diləmək deyilir. Bir işi qəbul etməyə, etiraz etməməyə **"Riza"**, bəyənmək deyilir. İşin edilməsinə təsir etmək şərti ilə iradə ilə qüdrətin birliyinə **"Xəlq"**, yaratmaq, təsirli olmadan bu birliyə **"Kəsb"** deyilir. Hər ixtiyar edənin xaliq olması lazım deyil. Həmçinin, hər iradə edilən şeydən, razı olmaq lazım deyil. Allahu təalaya xaliq və muxtar deyilir. Qula, kəsib və muxtar deyilir.

Allahu təala qullarının itaətkarlıqlarını, günahlarını iradə edir və yaradır, lakin  itaətkarlıqdan razı olduğu halda, günahdan razı deyildir. Hər şey Onun iradə və xəlq etməsi ilə var olur. Ənam surəsinin 102-ci ayəti-kəriməsində məalən, **"Ondan başqa ilah yoxdur. Hər şeyin xaliqi, ancaq Odur"** buyurulmuşdur.

**"Mutəzilə"** firqəsində olanlar iradə ilə rıza arasındakı fərqi görə bilmədiklərindən, çaşbaş qaldılar. Beləliklə, insanın dilədiyi işi özü yaratdığını dedilər, qəza və qədəri inkar etdilər. **"Cəbriyyə"** firqəsi də, tamamilə çaşıb qaldı. Xəlq etmədən ixtiyarın olacağını anlamadılar. İnsanda ixtiyarın olmadığını zənn edərək, insanı daşa, oduna bənzətdilər. İnsan, haşa, günah sahibi deyildir. Bütün pislikləri gördürən Allahu təaladır, dedilər. Cəbriyyə mənsublarının dediyi kimi, insanda iradə və ixtiyar olmasaydı, pislikləri, günahları, Allahu təala məcbur edərək gördürsəydi, əli-ayağı bağlanıb dağdan aşağı atılan biri ilə, yeriyərək, ətrafını seyr edərək enən

birinin hərəkətlərinin bir-birindən fərqli olmaması lazım olardı. Halbuki, birincinin yuvarlanması məcburi, ikincinin enməsi, iradə və ixtiyar ilə olmaqdadır. Aralarındakı fərqi görə bilməyənlərin düşüncələri qıtdır. Həm də, ayəti-kərimələrə inanmamış, Allahu təalanın əmrlərini, qadağalarını, lüzumsuz, yersiz görmüş olurlar. Mütəzilə və ya qədəriyyə adlı firqənin dediyi kimi, insan dilədiyini özü yaradır zənn etmək də, **"Hər şeyi yaradan Allahu təaladır"** ayəti-kəriməsinə inanmamaq olduğu kimi, yaratmaqda, insanlar Allahu təalaya şərik və ortaq edilmiş olur.

Şiələr də, Mütəzilə kimi, insan dilədiyini yaradar deyirlər. Eşşəyin dəyənək yediyi halda sudan keçmədiyini buna dəlil göstərirlər. Bunlar düşünmür ki, insan bir işi etmək istəsə, Allahu təala da, o işin görülməsini istəməsə, Allahu təalanın dilədiyi olacaq. Mütəzilənin sözünün səhv olduğu aydın olur. Yəni, insan hər dilədiyini edə bilməz və yarada bilməz. Onların dediyi kimi, insanın hər istədiyi olarsa, Allahu təalanın aciz olması lazım gələr. Allahu təala acizlikdən münəzzəhdir, uzaqdır. Ancaq Onun iradə etdiyi olur. Hər şeyi yaradan, var edən yalnız Odur. Allahlıq belə olur. İnsanlar üçün, "onu yaratdı, bunu yaratdılar" kimi ifadələrdən istifadə etmək və yazmaq çox çirkindir, Allahu təalaya qarşı ədəbsizlikdir, küfrə səbəb olar.

[Qulların ixtiyari hərəkətləri öz iradələri ilə olmayan, hətta xəbərləri belə olmadan, fiziki, kimyəvi və fizioloji hadisələrlə meydana gəlir. Bu incəliyi anlamış insaflı bir elm adamı öz ixtiyari hərəkətlərinə, "yaratdım" demək bir yana, "mən etdim" deməyə belə çəkinər, Allahu təaladan həya edər. Biliyi, anlayışı və ədəbi az olan isə hər yerdə hər şeyi deməkdən çəkinməz.

Allahu təala dünyada bütün insanlara rəhm edir. Möhtac olduqları şeyləri yaradıb, hər kəsə göndərir. Dünyada rahatlıq və hüzur içində yaşamaları və axirətdə əbədi səadətə qovuşmaları üçün nə etmələri lazım olduğunu açıq bir şəkildə bildirir. Nəfslərinə, pis yoldaşlarına, zərərli kitablara və radiolara aldanaraq, küfr və zəlalət yoluna düşənlərdən, dilədiyini hidayətə qovuşdurur. Bunları doğru yola çəkir. Azğın, zalım olanlara bu nemətini ehsan etmir.

Onları bəyəndikləri, istədikləri və içinə düşdükləri inkar bataqlığında tərk edir].

**“Etiqadnamə”** kitabının tərcüməsi burada tamamlanmış oldu. Bu tərcüməni edən hacı Feyzullah Əfəndi Ərzincanın Kəmah bölgəsindəndir. Uzun illər Sökədə müəllimlik etmiş, 1323-cü [m. 1905] ildə də vəfat etmişdir. Kitabın müəllifi, Mövlanə Xalidi Bağdadi Osmani (qüddisə sirruh), 1192-ci hicri ilində Bağdadın şimalında Şəhrəzur şəhərində doğulmuş, 1242-ci [m. 1826] ildə də Şamda vəfat etmişdir. Osman Zinnureynin (radıyallahu anh) nəslindən olduğu üçün Osmani deyilir. Qardaşı Mövlanə Mahmud Sahib həzrətlərinə imam Nəvəvinin **“Hədisi-ərbəin”** kitabındakı ikinci hədis olan və **“Hədisi-Cibril”** adı ilə məşhur hədisi-şərifi oxudarkən, Mövlanə Mahmud Sahib, bu hədisi-şərifi izah edərək yazmasını böyük qardaşından istəmişdi. Mövlanə Xalid (rəhmətullahi aleyh), qardaşının nurlu qəlbini xoş etmək üçün bu diləyi qəbul etmiş və bu hədisi-şərifi fars dilində şərh etmişdir.

**Oyan, gözün aç, ağıl, yalvar gözəl Allaha!**
**Yolundan heç ayrılma, yalvar gözəl Allaha!**

**Hər gün beş namazı qıl, Ramazanda oruc tut!**
**Malın çoxsa zəkat ver, yalvar gözəl Allaha!**

**Bir gün bu gözün görməz, həm qulağın eşitməz,**
**Bu fürsət ələ keçməz, yalvar gözəl Allaha!**

**Sağlığı qənimət bil, hər saatı nemət bil,**
**Əmrinə itaət qıl, yalvar gözəl Allaha!**

**Ömrünü boş keçirmə, nəfsinə qüvvət vermə,**
**Oyan! Qəflət eyləmə, yalvar gözəl Allaha!**

**Günahın çox olsa da, ondan ümidin kəsmə,**
**Əfvi, kərəmi boldur, yalvar gözəl Allaha!**

**Səhər vaxtı rəhməti yağar hər məmləkətə,**
**O vaxt paklanar qəlbin, yalvar gözəl Allaha!**

**Allahın adın yad et, ruhun və qəlbin şad et,**
**Bülbül kimi fəryad et, yalvar gözəl Allaha!**

**Mövlanə Xalidi Bağdadi**

# Hər Kəsə Lazım Olan İman

Texniki redaktor:
HÜSEYN KƏRİMOV

Səhifələyici:
SƏDAQƏT KƏRİMOVA

Çapa imzalanmışdır: 25.01.2021.
Ölçü: 60x90 1/16. Çap vərəqi: 5,5. Sifariş: 012/21. Say:5000 ədəd.

**"N/R"**
Nəşriyyat-Poliqrafiya
Mərkəzi

Bakı, Az1122, Zərdabi pr. 78
Tel: 4977021 / Faks: 4971295